Sözümün
canı-dərd,
Dilimin
sözü-qəm...
Bir ildir
qurumur,
Şahinin
gözü nəm...

İztirab
bağında
hər kədər
gül olub,
Bağbanı
özüməm,
Bağbanı
özüməm!!!



Şahin FAZİL İlnamə yaxud Səndən ayrı səninlə

Şahin FAZİL

# İlnamə yaxud Səndən ayrı səninlə

ŞAHİN FAZİL

# İLNAMƏ, YAXUD SƏNDƏN AYRI SƏNİNLƏ

BAKI-2002

**Redaktoru:** Nazilə FAZİL

Şahin FAZİL.
**İLHAMƏ, YAXUD SƏNDƏN AYRI SƏNİNLƏ.**
"Elnur-P". Bakı-2002. 224 səh.

**Kitabın başlanğıcında gedən 40 şer müəllifin "Qırxnamə, yaxud qırx şerdən ibarət Elegiya" adlı kitabından götürülüb "İlnamə"yə daxil edilmişdir. "İlnamə" isə ömür-gün yoldaşını itirən şairin bir il ərzində keçirdiyi iztirabların poetik in'ikasıdır.**



***1-ci gün***

## QƏZƏL

Yenə göz yaşına çatmaqda gücü, yar ağlar,
Olaraq çarəsi yox dərdə giriftar, ağlar.

Eləyim mən nə sayaq dərdinə dərman indi,
Çarəsizlik yenə boş çarə pıçıldar, ağlar.

Ya İlahi, niyə qoydun bu fəlakətdə bizi?
Nə dözüm canda qalıbdır, nə təpər var, ağlar.

Yarının heykəli sınmaqdadı sürətlə bu gün,
Çırparaq əllərini başına memar ağlar.

Dağlayır qəlbi kaman indi nəva eyləmədən,
Dəyməyir simlərə mizrabı, fəqət tar ağlar.

Neçə gün cəhd elədim dərdinə bir çarə ola,
Tapa bilməzsə təbib çarəni naçar ağlar.

Tökdü göz yaşını Şahin günahı var kimi,
Kim görübdür günah etməzsə günahkar ağlar.

*29.04.2001*

*2-ci gün*

## SON SÖZ, SON SƏS...

Son dəqiqələrindi,
son anlarındı həyatda,
Sən alt qatında idin bu canlı aləmin,
ölüm üst qatda,
Dilin tez-tez
"öldüm...", "ölürəm..." deyirdi,
gözlərin öləziyirdi,
ruhun tərk etmək istəyirdi
58 il qaldığı can qəfəsini,
eşidirdik son sözünü, son səsini,
nəfəsin səngiyirdi,
hər an, hər ləhzə, hər dəm:
"öldüm...", "ölürəm...",
"öldüm...", "ölürəm...".
Tərk edirdi ruh canı,
Təbib əlini tutmuşdu,
Əzrayıl yaxanı...
Bizdə hüzn,
səndə qəm:
"öldüm...", "ölürəm...",
"öldüm...", "ölürəm..."



Budur, artıq yoxsan...
Axşam bu evimizdə görünməz olacaqsan,
axşam gedəcəksən qəbr evinə,
bu gün son suallarım var sənə:
Atan Maqsudun,
anan Malikənin
ruhumu çağırdı səni?
Bacıların Nailənin,
Naibənin
ruhumu çağırdı səni?
Darıxıbdılarmı sənsiz?
Ayrı qala bilmədimi
sevən sevənsiz?
Poliartrit xəstəliyi ilə yaşamaq
sənə çox çətin oldumu?
çox-çox çətin oldumu?
Qızlarından soruşmamışam hələ:
Onlara vəsiyyətin oldumu?
Səni o dünyaya tək buraxdığım üçün
məni
məzəmmət elədinmi?
Əzrayıla "xoşgəldin" dedinmi?..

*30.04.2001*

*3-cü gün*

## QƏZƏL

Nə edim, çatdı vida növbəsi yarım getdi,
Kədərim gəldi, qəmim gəldi, xumarım getdi.

Varlığı sərv təkin qəddimi qaldırmışdı,
Yoxluğu qamətimi əydi, vüqarım getdi.

Tuturam nəbzimi hiss eyləmirəm vurmağını,
Qurudu ot sayağı sanki damarım, getdi.

Elə zənn eyləyirəm ki, hava gəlmiş başıma,
Havanı neyləyirəm ki, havadarım getdi.

Bir də mey nəşəsi gəlməz mənə, badəm sındı,
Saqi, meyxanə qıfıllandı, açarım getdi.

Dizimin gəldi əyilmək deyilən əyyamı,
Taqətim yoxdu daha, səbrü qərarım getdi.

Nigəran eylədi ovqatımı, gəlsin növbəm,
Şahinəm, getməliyəm mən də, nigarım getdi.

*1.05.2001*



*4-cü gün*

## BİR HƏYATIN SON DƏQİQƏLƏRİ

Əli, ayağı soyuyurdu...
Bu isti gündə
sanki qışdı...
Gözünün ziyası azalmaqdaydı,
Üzü avazımışdı...
Neçə gündü
su içirdi fəqət,
yeməyi yoxdu,
Hamıdan kömək diləyirdi,
köməyi yoxdu.
Mərəzi artmaqda,
Gücü tükənməkdəydi.
Qüssədən
sanki çiynimə
şələ-şələ
yük enməkdəydi.
Görürdüm hamını
çarəsizlik,
məyusluq,
fağırlıq altında,
Qalmışdım

Şahdağ boyda
ağırlıq altında...
Yığılmışdı başına qohum-qonşular,
Hamı pərişan, hamı zar...
Dizini qucaqladım,
ağladım.
Dizinin taqətsizliyi
dizimə keçdi,
Gözünün qaranlığı
gözümə keçdi,
Üzünün solğunluğu
üzümə keçdi.
Təbib məni otaqdan çıxardı...
Ölmək istəyirdim,
yaşamağa nə vardı...

*2.05.2001*



***5-ci gün***

## QƏZƏL

Ölməliyəm, öldürəcək həm məni,
Şad edə bilməz daha aləm məni.

Gündə mələklər qayılıb yanına
Söyləyəcəklər ki, üzür qəm məni.

Qəmlərimi bildirəcəklər sənə,
Görməyəcəklər axı xürrəm məni.

Düşməyəcək nalə canımdan uzaq,
Zar edəcək hər gecə naləm məni.

Gəlsəm əgər cənnətə pişvaz elə,
Ülfətinə qərq elə möhkəm məni.

Söndürəcəkdirmi behişt yanğımı?
Yandıracaq yoxsa cəhənnəm məni?

Şahinə gülməz bu cahan bir daha,
Şad edə bilməz daha aləm məni.

*3.05.2001*

## "SƏNİ YARIMÇIQ QOYDUM" DEDİN...

Bütöv gün
və yarımçıq gecə
müalicəsi bitdi.
Hamı çıxıb getdi...
Uzanmışdıq yataqda,
Üzərimizdə kədər buludlanmışdı...
Üzü dumanlanmışdı,
Gözünə çən düşmüşdü,
Səsi gücdən düşmüşdü...
"Gedirəm" dedi,
"Bütöv gedirəm" dedi,
"Səni yarımçıq qoydum" dedi,
"Səni yarımçıq qoydum" dedi,
"Səni yarımçıq qoydum" dedi.
Zülüm-zülüm ağladı,
inlədi...
Nəydi?
Bu sözlərin mənası nəydi?
"Səni yarımçıq qoydum" nəydi?
Çox düşündüm,
başa düşmədim.



Hər gecə düşündüm,
başa düşmədim,
Hər necə düşündüm,
başa düşmədim.
Öz-özümə "düşün" dedim, "bil" dedim.
"Səni yarımçıq qoydum" nə deməkdi?
Həyatıma işarəmi? Bilmədim.
İşlərimə işarəmi? Bilmədim.
Az qalıb...
Gedib soruşacağam özündən,
Söz çəkəcəyəm sözündən,
Soruşacağam o sözlərinin mənasını...
Bürünüb sənin kədərinin buluduna,
üzünün dumanına,
Ey məni yarımçıq qoyan yarım,
Bütöv gələcəyəm yanına!

*4.05.2001*

*7-ci gün*

## ÖZÜN OLACAQSAN HURİ ŞAHİNƏ!

Məni yaraladı amansız fələk,
Səni araladı yanımdan mənim.
Cismimi biryolluq tərk eləyərək
Canım sənlə getdi, deyil can mənim.

Sənin ömür gəmin çatdı sahilə,
Sahilin yanında dayanana bax.
Dərya axarını saxlasa belə,
Gözümün yaşları dayanmayacaq.

Üzümdə qüssə var, gözümdə kədər,
Əsiri olmuşam qüssənin, qəmin.
Üzümə süzülür gözümdəkilər,
Mənəm ən bədbəxti bu gün aləmin.

Söndürmək mümkünmü amma sevgimi,
Ayrıla bilmərəm məhəbbətindən.
Yanımdan getsən də bir mələk kimi,
Cənnətə, yanına gələcəyəm mən.

Məni əzəlki tək yenə sevən bil,
Göstər üzündəki nuri Şahinə.
Orda başqa huri gərəyim deyil,
Özün olacaqsan huri Şahinə!

*5.05.2001*



*8-ci gün*

## ÜZÜMÜN TÜKLÜ DONU

Əfqanıstanda
qap-qara saqqalım vardı,
sonra ala-bula oldu,
sonra ağardı...
Sənin heç xoşuna gəlməzdi
məni qoca göstərən
üzümün tüklü donu.
Zarafatla deyərdin
"bir gecə mən
sən
bərk yuxuya gedəndə
durub qayçılayacağam onu".
Amma,
bir gün bərk israr elədin
"Mən öləndə saqqal saxlarsan" dedin.
İllər ötdü... İlahi,
yaş çoxaldı, İlahi,
Xəstələndi, İlahi,
Dünyasını dəyişdi, İlahi,
Yadıma neçə il qabaq
dediyi sözü düşdü, İlahi:
"Mən öləndə saqqal saxlarsan".
Ey gidi dünya,

Ey Pərvərdigar,
indi o yoxdur,
saqqalsa var.
(Kaş əksinə olaydı,
O, yanımda qalaydı).
Ona "xudahafiz",
Saqqala "xoşgəldin" deyib
Ardınca ağladım,
ruhu şad olsun,
Qapıma qara bağladım,
ruhu şad olsun,
Saqqal saxladım,
ruhu şad olsun.
Mən ölənəcən
qalacaq
üzümdə
üzümün tüklü donu,
təraş etməyəcəyəm onu.
"Mən öləndə saqqal saxlarsan"...
Əzizim, mən
çıxmıram sözündən,
əməlim əmrinin ardınca gedir,
axı söz qədri bilən
bir şairə
söz deyilibdir!

*6.05.2001*



*9-cu gün*

## ÖLÜM HAQDI!..

Bir məzarlıq yerin sinəsi,
külünglə, bellə dağlanmışdı.
Qəbrin torpağı
qəbrin kənarında
qalaqlanmışdı.
Ölüm haqdı!..
O torpağın bir hissəsi
bir azdan
yenidən
öz yerini tapacaqdı...
Molla
"ayaqqabını çıxarıb qəbrə gir" dedi,
Dediyini elədim,
axı qəbir
indi evdir,
onun evidir,
Evə girərlər ayaqqabısız.
Qəbir
mənzildir
pəncərəsiz, qapısız,
Daha oraya girən olmayacaq,
Oranı silib-süpürən olmayacaq...

...Sağ böyrü üstə uzanmışdı,
Molla Quran oxuya-oxuya hökm edirdi:
"Gözlərinə torpaq tök" dedi,
Tökdüm.
"Əllərini çarpazlayıb
cəsədin üstə əyil
və sağ əlinlə sağ qolunu,
sol əlinlə sol qolunu tərpət" dedi,
Tərpətdim,
Bu əməliyyat
dörd dəfə davam etdi,
bitdi.
Mərasim yetişdi sona.
Son dəfə baxdım ona:
Əli-ayağı bükülüb,
Gözünə torpaq tökülüb,
Tərpətdim,
tərpəndi...
Tərpətmədim,
tərpənmədi...
Onda bildim ki,
ölüb!..

*7.05.2001*





## QƏZƏL

Tərk eylədi gül bağbanı, zərgər zər itirdi,
Şair isə sındırdı qələm, dəftər itirdi.

Bundan belə günlərlə susub lal olacaqdır,
Şair dili dillənməyəcək, dilbər itirdi.

Aşiq o adamdır ki, çəkir eşqdə zəhmət,
Eşqində bu aşiq neçə batman tər itirdi.

Səhvən məni yersiz yerə hüşyar sanıbdır,
Hüşyar deyil öyləsi ki, xəncər itirdi.

Cövhərşünasın cövhəri getmişdir əlindən,
Gövhərşünasa bax ki, nə cür gövhər itirdi.

Şahin ki, gözündən bu qədər yaş axıdıbdır,
Şəkk eyləməyin, hər gözü bir Tərtər itirdi.

*8.05.2001*

*11-ci gün*

## GƏLƏRƏM YANINA

Hayana getdimsə
Yanına qayıtdım.
Əfqana yollandım,
yanına qayıtdım.
İrana yollandım,
yanına qayıtdım.
Turana yollandım,
yanına qayıtdım.
Çox yana yollandım,
yanına qayıtdım.
Sən isə,
qədrimi bilmədin,
Hicrana yollandın,
gəlmədin.
Vəfasız,
mən isə, mən isə
dözməyib acı hicranına
gələrəm, gələrəm yanına!..
Bəxtim tək
qır kimi qaranlıq bir gecə,
ya gün tək işıqlı bir səhər
Yaradan mərhəmət eləsə,
Yəqin ki, ruhumuz görüşər.
Dözməyib acı hicranına
gələrəm, gələrəm yanına!

*9.05.2001*



*12-ci gün*

## NİSGİL

Əcəldən möhlət istəyirdi,
"Qoy bir az da yaşayım" deyirdi...
Əcəl kimə möhlət verib ki?
Canında yaşamaq alovu vardı,
Qızdırmadan alışıb yanardı,
Elə yanardı ki,
hərarətiylə
bizi də yandırardı.
Olmadı əlacı,
yetişdi ömrünün sonu,
mən ondan böyükdüm,
itirdim onu.
Ey bizi yaradan, inan ki,
havalanmışam sanki,
Sanki başımdakı havanın
ton-ton çəkisi var,
məni hey sıxar, sıxar...
Təki
hava məni elə sıxsın ki,
birdən-birə

girim yerə,
Ruhum uçsun onun yanına,

yetişim haqq divanına,
Ərz edim:
Anlaya bilmirəm hələ də
bu nə işdi?
bu nə gedişdi?
Yenicə doğulan
körpə nəvəsini görməmişdi...

*10.05.2001*

***13-cü gün***

## QƏZƏL

Oluram qəti əmin fikr eləyib hər qədəri:
Sevə bilməz məni bir kimsə o dilbər qədəri.

Söyləyərdim ona "ey yar, çox olsun ömrün,
Bürüyən bağçamızı lalə-sənubər qədəri".

Çox təəssüf ki, əlimdən o gülü aldı fələk,
Dərdimi saysa münəccim - olar ülkər qədəri.

Belə eylərsə davam, uçmalıdır bir neçə ev -
Gözlərimdən yaş axıbdır yerə Tərtər qədəri.

Ya İmam Mehdi, yetiş dadə ki, qəm, qüssə, kədər,
Yığışıb üstümə gəlməkdədi kafər qədəri.

Deməsinlər mənə "Şahin, yarı az mədh elə", yox,
Ona söz yazmalıyam mən neçə dəftər qədəri.

*11.05.2001*



***14-cü gün***

## QƏZƏL

Gözlərim tökməyəcək yaş, daha qan ağlayacaq,
Ürəyim eyləyəcək nalə-fəğan, ağlayacaq.

Baxıram, şəklini mən canlı güman eyləyirəm,
Acı gerçəkliyə fərziyyə, güman ağlayacaq.

Buludun ağlamağı heç də təəccüblü deyil,
Bağda meh, bağçada şeh, dağda duman ağlayacaq.

Var imiş faciəli günləri bu bədbəxtin,
Cıracaq köynəyi əynində, yaman ağlayacaq.

Gəzəcək gözləri Leylasını Məcnun sayağı,
Tapmayıb sevgilisindən o nişan ağlayacaq.

Fələyin qəm kamanından yağacaq qüssə oxu,
Cana dərd oxları batdıqca kaman ağlayacaq.

Arxayınlıqdı, yanındaydı yarı, indi isə
Qoca Şahin gecə-gündüz nigaran ağlayacaq.

*12.05.2001*

*15-ci gün*

## QƏZƏL

Bu torpaq qarə torpaqdır, bitən al lalə var üstdə,
Çökən şəbnəmmidir, ya göz yaşımmıdır laləzar üstdə?

Məni mərsiyyə şeri yazmağa vadar edir dərdim,
Qabar var barmaq üstündə, qələm vardır qabar üstdə.

Evim bərbad olubdur sən gedən gündən, görürlər ki,
Fəqir bir dərviş əyləşmiş uçulmuş bir divar üstdə.

Dəmadəm eylərəm hər gün təmənna ibni-Mülcəmdən
Ki, qan çıxsın damarımdan, qaralsın zülfüqar üstdə.

Bu aləm sirli aləmdir, bu dünya gizli dünyadır,
Bilən yoxdur nə var altda, bilən yoxdur nə var üstdə.

Çinar üstdə göyərçin var, uçub qonmuş tələş ilə,
O, bəlkə ruhidir yarın oturmuşdur çinar üstdə.

Fəlakət basdı çiynindən və qəddi-qaməti sındı,
Yarı görmək dilər Şahin, əyilmişdir məzar üstdə.

*13.05.2001*



*16-cı gün*

## SON MƏNZİL

Yollandıq sənin
son mənzilinə
Və həmin mənzilə
düşdü güzarın.
O mənzil
nə Göyçayda oldu,
nə Qubada,
Biləcəridə qazıldı məzarın,
Vətən torpağıdır bu da.
Qəbirqazan
səliqə-sahmanla
hazırlamışdı sənin son otağını,
Bir azdan örtəcəkdi
qəbrin qapağını,
qalacaqdın orada
o məskənin sahibi tək,
yorğanın kəfən,
kəfənin döşək.
Düşdüm qəbrinə,
sənlə mən tək qaldıq,
örtük tutuldu məzarın üstünə,
son dəfə

söhbət etdim səninlə,
Mən danışdım,
sən asdın qulaq,
Söhbətimizi kimsə eşitmədi,
"nə dil bildi, nə dodaq".
Sənə dedim ki,
qırxın çıxanacan
canımdan qırx şer çıxacaq,
qırxından sonrakı gün
təkcə gələcəyəm ziyarətinə,
oxuyacağam
şerlərinin qırxını da sənə.
Son mənzilində
son dəfə
söhbət etdim səninlə...
Yuxarıda adamlar,
aşağıda mən və sən,
Mən tər içindəydim,
Sən kəfən.

*14.05.2001*



*17-ci gün*

## QƏZƏL

Mən o gündən ki, itirdim səni, ey dadi-bidad,
Xəzələ döndü ömür gülşəni, ey dadi-bidad.

Qismətim ahü fəğan, nalə olur gündüzlər,
Gecələr qaldırıram şivəni, ey dadi-bidad.

Gözümün yaşı tükənsə, o duman-çən ki qalır,
Gözlərim cəzb edəcəkdir çəni, ey dadi-bidad.

Sən idin yelkəni, qərq olmada eşqin gəmisi,
Badə verdin nə üçün yelkəni, ey dadi-bidad?

Zəifəm öylə ki, əsdikdə külək, asimana
Toz kimi qaldıracaqdır məni, ey dadi-bidad.

Sən ömür məskənini tərk eləyib getmişsən,
Necədir qəbr evinin məskəni, ey dadi-bidad?

Şahinin sındı beli, yay kimi qatlandı dizi,
Pis günə qoymada təklik məni, ey dadi-bidad.

*15.05.2001*

*18-ci gün*

## BUNDAN SONRA

Bundan sonra
mən taleyi kəm
evə tələsməcəyəm,
çünki sən yoxsan.

Bundan sonra
biləcəyəm hesabımı,
döyməyəcəyəm qapımı
taq-taraq,
döysəm də açılmayacaq,
çünki sən yoxsan.

Bundan sonra
öz-özümdən diləyəcəyəm köməyimi,
Şahanəm Şamaxıdadır,
Ülviyyəm bişirməsə
özüm bişirəcəyəm xörəyimi,
çünki sən yoxsan.

Bundan sonra
işim başımdan aşacaq,
qazanda xörəyim soyuyacaq,
çaydanda çayım daşacaq,
çünki sən yoxsan.
Bundan sonra



nə qədər ki sağam,
hər təzə yazdığım şeri
daşa, divara oxuyacağam,
çünki sən yoxsan,
çünki sən yoxsan...

*16.05.2001*

*19-cu gün*

## QƏZƏL

Getdi yarım, deməırəm qoy gələ, ey kaş, əvəzi,
Sirrimi kim biləcək bir də o sirdaş əvəzi?

Bazara getməliyəm tez başımı satmaqçın,
Bir ölüm almalıyam mən orada baş əvəzi.

Ey fələk, sən mənə yaqut, mənə zər verməmisən,
Bircə yarım var idi bir neçə daş-qaş əvəzi.

Əlini saxla, dayan, başıma daş atma daha,
Dağ tökülsün, qaya uçsun başıma daş əvəzi.

Ürəyim ney tək edir nalə, gözümdən üzümə
Qara qan axmalıdır indi bəyaz yaş əvəzi.

Şahina, taleyimin güzgüsü tək sındı qələm,
Qələmi kim yonacaqdır o qələmqaş əvəzi?

*17.05.2001*

*20-ci gün*

## TİKAN BİTƏCƏKDİR GÜL ƏVƏZİNƏ

Bu qaranlıq günüm, bu qara baxtım,
Taqətsiz qalmışam bir bihuş kimi.
Necə şahinəm ki, səni buraxdım,
Çırpınıb əlimdən çıxdın quş kimi.

Fələk daş atacaq başıma mənim,
Hələ üzərimə nələr yağacaq.
Baxmayıb gözdəki yaşıma mənim,
İnsaf buludundan kədər yağacaq.

Gözü ürəyimin qan ağlayacaq,
Daha xoş günümdən əsər görünməz.
Əlim təsbeh deyil, qüssə sayacaq,
Canımda əzəlki təpər görünməz.

Daha mənim ömrüm gedibdir yelə,
Daha fərəh hissi məndən qaçaqdır.
Vüsal qapıları bu gündən belə
Üzümə büsbütün qapanacaqdır.

Tufanlar əsəcək könül bağında,
Göz yaşı axacaq sel əvəzinə.
Ömür ağacımın hər budağında
Tikan bitəcəkdir gül əvəzinə.

*18.05.2001*



*21-ci gün*

## CAVABLANMAYACAQ SUALLAR

Neçin getdin?
Ağ vüsaldan
üstün tutdun
qara fərağı...
Neçin getdin?
Getmək istəmirdin axı,
Neçin getdin?
Ağır aylar,
Çətin illər
geridə qalmışdı,
tez-tez önümüzə çıxan müşküllər
geridə qalmışdı,
Acılar, qəhərlər
geridə qalmışdı,
Yad ölkələrə səfərlər
geridə qalmışdı...
Qızlarına baxıb sevinərdin,
neçin getdin axı?
Kürəkənlərinlə öyünərdin,
neçin getdin axı?
Ürəyin
nəvələrinlə döyünərdi,

neçin getdin axı?
Əlli səkkiz yaşındaydın,
tez deyildimi?
İki ildən çoxdu ki,
Həyatla ölüm savaşındaydın,
tez deyildimi?
Söz yox ki,
cavanlığımız geridə qalmışdı,
tez deyildimi?
Həmişə
nədənsə
qocalmağını arzuladığın
Şahinin qocalmışdı,
tez deyildimi?
Vüsaldan üstün tutdun fərağı...
Mən qocanı tək qoyub
neçin getdin axı?

*19.05.2001*



*22-ci gün*

## SÜRUD

Yarımı yadə salıb şamü səhər ah edirəm,
Görəsən köksüm içində nə qədər ah qalıb?
Kədərimdən neçə min aləmi agah edirəm,
Görəsən köksüm içində nə qədər ah qalıb?

Yar uzaq oldu ki, ahim uzaq olmur məndən,
Deyirəm bəlkə günahim uzaq olmur məndən?
Bəlkə ahimdi pənahim, uzaq olmur məndən,
Görəsən köksüm içində nə qədər ah qalıb?

Sayını bilməyə çox cəhd elədim hərgahi,
Olmadı amma müyəssər bu mənə vallahi,
Bir mühasib baba vardırmı ki, saysın ahi?
Görəsən köksüm içində nə qədər ah qalıb?

Saxlaya bilməyirəm, gah dayanır, gah çıxır,
Köksümün həcmi böyükmüş necə, eyvah, çıxır,
Məni tərk eyləyibən gör nə qədər ah çıxır,
Görəsən köksüm içində nə qədər ah qalıb?

Gah rahət eləyib ah, üzür gah məni,
İmtahanmı eləyir həzrəti-Allah məni?
Deyəsən qəbr evinə yollayacaq ah məni,
Görəsən köksüm içində nə qədər ah qalıb?

Özüm öz xislətim ilən bacara bilməyirəm,
Sanki ahdan savayı dərdə çara bilməyirəm,
Nə qədər ah çıxıbdır kənara bilməyirəm,
Görəsən köksüm içində nə qədər ah qalıb?

Şahinəm, yar güvənc idi, güvəncim yoxdur,
Gövhərim getdi əlimdən, daha incim yoxdur,
Köksüm içrə azacıq, zərrə sevincim yoxdur,
Görəsən köksüm içində nə qədər ah qalıb?

*20.05.2001*





## QƏZƏL

Aşiqin sevgi bağı gör nə təhər təkləndi,
Daha yox təmtəraqı, gör nə təhər təkləndi.

Yatağı buz kimidir, qızdıra bilmir canını,
İki aşiq yatağı gör nə təhər təkləndi.

Neçə gündür neçə dostu onu yad eyləməyir,
Çəkilib dost ayağı, gör nə təhər təkləndi.

Titrədərdi bu qəzəlxan çoxunu, indi isə
Titrəyir dil-dodağı, gör nə təhər təkləndi.

Şerinin şöləsi çox səmtə yayılmaqdaydı,
Daha sönmüş çırağı, gör nə təhər təkləndi.

Quruyub ömr ağacı çırpılacaq torpağə,
Yıxılıbdır dayağı, gör nə təhər təkləndi.

Qeyri dilbər tuta bilməz yerini, ey dilbər,
Şahinin qəlb otağı gör nə təhər təkləndi.

*21.05.2001*

*24-cü gün*

## KARVAN GEDİBSƏ DƏ, ZƏNG SƏSİ QALIB...

İnsaflı olsaydı fələk nə vardı,
Fənalıq kədəri qonmazdı üzə...
Əlini əlimdən çəkib qopardı,
Cismini yolladı gedər-gəlməzə.

Xəyalın başında, adın dilində,
Bu kəsin quruca nəfəsi qalıb.
Gedib qərar tutdun son mənzilində,
Karvan gedibsə də, zəng səsi qalıb...

Səbr ipim çəkilib yenə tarıma,
Canım zəifləyir mənim get-gedə.
Sən gedən dünyadan qulaqlarıma
Çağırış sədası eşidilmədə.

Dərya içindəyəm sınıq qayıq tək,
Ümidim də yoxdur sahilim olsun.
Qüssəmi, qəmimi deməkçin gərək,
Bir dilim olmasın, min dilim olsun.

Sakitlik qalmayıb daha canımda,
Aram olmayıram, nə gündəyəm mən...
Səhər mehi kimi gah eyvanımda,
Gah da ki qəbrinin üstündəyəm mən.

*22.05.2001*



*25-ci gün*

## SƏNDƏN SONRA

Sanki
havanın tozu çoxalıb
dolub otaqlarıma...
Yoxsan ki,
əsəbim çəkilib tarıma...
Yoxsan ki,
sevincə yadam,
(Ey səbirsiz,
hövsələsiz adam,
hünərin varsa
əsəbi hövsələdən ayır),
Külək açıb pəncərələri,
pərdələr
arsız-arsız oynayır...
Paltar-palazı güvə yeyir...
Saatlarımızın biri yatıb,
biri işləyir...
Axşam vaxtı
qara basır mən qarabaxtı...
Evimizdən fərəh qaçıb,
eyş ötüşüb...
Göy köynəyimin düyməsi düşüb...
Şalvarımın dizləri torbalanıb...
Neçə dəfə əlim yanıb...
Başmaqların geyilmir daha...

Deyəni eşitmirsən deyə
sənə şer deyilmir daha...
And olsun Allaha,
Yanımda olmasan da,
xatirimdə ömürlük yaşarsan.
Daha sənə "yoxsan" deməyəcəyəm,
bu dünyada yoxsansa,
o dünyada ki varsan!

*23.05.2001*

*26-cı gün*

## ÖMÜRLÜK

*(Qoşma)*

Daha dincliyimi bitirmişəm mən,
Həzzim, rahatlığım bitdi ömürlük.
Səadət iziylə gedirmişəm mən,
Səadət əlimdən getdi ömürlük.

Qalan günlərimin varmı bəyazı?
İstini qeyb edib tapdım ayazı.
Bu alın yazısı, bu müdhiş yazı
Ömrümdə qapqara xətdi ömürlük.

Mənəm aşiqlərin safı, düzgünü,
Tənhalıq üzgünü, təklik üzgünü...
Ey Şahin, neynirəm bu ömür-günü,
Ömür-gün yoldaşım itdi ömürlük.

*24.05.2001*



*27-ci gün*

## QƏZƏL

Neçə gündür ki, təkəm, yar ilə söhbət düşməz,
Çünki yoxdur o daha, söhbətə fürsət düşməz.

Gedəcək cənnətə imanlı müsəlman, ey yar,
Arizu eyləsə də kafərə cənnət düşməz.

Lüğətimdən silibən atmışam "işrət" sözünü,
Yas tutan kimsəyə, əlbəttə ki, işrət düşməz.

Namə inşa eləyib göndərirəm gündə sənə,
Belə həm olmalıdır, boynuma minnət düşməz.

Göz yaşımlan yazıram, amma mürəkkəblə deyil,
Bu səbəbdən də mənim məktubuma xətt düşməz.
Dizimin qüvvəti yoxdur, gözümün nuri daha,
Dərvişəm, yoxsa mənə bir də səyahət düşməz?

Yarımın yanına göndər məni, ey Allahım,
Şahin ölmək diləyir, ölsə qiyamət düşməz.

*25.05.2001*

## SIĞAL GÖZLƏYİRDİM ŞİLLƏ GÖRÜNDÜ...

Görürdüm özümdə dözüm həmişə,
Elə də dözümlü deyilmişəm mən.
Daha tabım yoxdur bu nəhs gərdişə,
Məcnun söyüdü tək əyilmişəm mən.

Bu il xəzan oldu baharım mənim,
Gülün əvəzinə güllə göründü.
Məni tərk elədi nigarım mənim,
Sığal gözləyirdim şillə göründü.

Taleyim bağımda tikan bitirib,
Canım hədəf oldu müsibətlərə.
Mən ata itirib, ana itirib,
İndi yetim oldum üçüncü kərə.

Fələk rəva bildi neçin bu dərdi,
Yıxılıbdır evim, uçubdur damım.
Həmişə fərəhlə günüm gələrdi,
İndi fəryad ilə bitir axşamım.

Daha sevincimə nöqtə qoyuldu,
Nəşə qığılcımı söndü gözümdə.
Üzümün təbəssüm çiçəyi soldu,
Saqqal becərirəm indi üzümdə.

*26.05.2001*





## QƏZƏL

Köksüm üstə fələyin qəm bıçağı dağ çəkir,
Təkliyin əlləri varmış, mənə caynaq çəkir.

Ağ günüm var idi, bir zərrə qaranlıq yoxdu,
Qara gün gözlərimə indi isə ağ çəkir.

Qeybdən bir səs eşitdim, "nə əsirsən böylə,
Hələ bu çərxi-fələk çərxini yumşaq çəkir".

Qeyb edəndən səni hey cin görünür gözlərimə,
Üzümü cırmaq üçün hər gecə dırnaq çəkir.

Qurulub dar ağacım sən yox olandan sonra,
Boynuma, kəndirimə cəllad isə yağ çəkir.

Kimi gülzarə tərəf getdi, kimi səhrayə,
Birini dağ çəkir, başqasını bağ çəkir.

Səni son dəfə məzar içrə görəndən sonra
Qaragün Şahinisə qapqara torpaq çəkir.

*27.05.2001*

*30-cu gün*

## QİTƏ

Bağlayan ömrünü ey mənlə, qırılmış o bağın,
Bağiban çox görəsi oldu gülüstanə səni.

Ey gözəlliklərə vurğun, bizi tərk eyləmisən,
Bir daha görməyəcək lalə səni, nanə səni.

Xatirə gəlmədə, getdik neçə yol Türkiyəyə,
Əfqanıstanə apardım, həmi İranə səni.

Kərbəla olmadı qismət sənə, söz vermişdim
Ki, bu il mən yetirim şövqlə o imkanə səni.

İncidibsən məni, hey səsləyirəm gəlmirsən,
Axı mən görməmiş idim mənə biganə səni.

Neçə gündür unudubsan o səmimanəliyi,
Görmüşəm mən axı hər ləhzə səmimanə səni.

Özü vermişdi cəhanə özü həm aldı geri,
Yaradan verməyəcək bir də bu dövranə səni.

Sənə mərd ismi verilmiş, mənəsə mərdanə,
Arayıb görməyəcək bir də bu mərdanə səni.

Gəzəcək gözləri Ülviyyənin əlbət həmişə,
Axtarıb tapmayacaq bir daha Şahanə səni.

*28.05.2001*



*31-ci gün*

## SÜRUD

Dərd axır qəm buludundan üzümə, fikr edirəm
Yardən başqa bir adəm məni şənləndirməz.
Yar öləndən gecə-gündüz adını zikr edirəm,
Yardən başqa bir adəm məni şənləndirməz.

Elə ki etdi məni zar o vəfadar öldü,
Bu qoca şairə gülzarü çəmənzar öldü...
Məni bayquş sayağı tək qoyuban yar öldü,
Yardən başqa bir adəm məni şənləndirməz.

Mənə izah eləsinlər ki, çəmənlik nə deməki,
Ya qızılgül nə demək, lalə-süsənlik nə demək...
Bilmərəm mən daha gülzardə şənlik nə demək,
Yardən başqa bir adəm məni şənləndirməz.

Zülfü andırmada sünbül, məni qəmləndirdi,
Çölə qov bülbülü, bülbül məni qəmləndirdi,
Bağiban, bağla bağı, gül məni qəmləndirdi,
Yardən başqa bir adəm məni şənləndirməz.

Qəbri üstdə qalayıb köksümə qəm yığnağını,
Qucuram gündə onun baş daşını, torpağını,
Bu təhər zənn eləmirdim axı hicran dağını,
Yardən başqa bir adəm məni şənləndirməz.

Çox yatan xilqəti ahim ki oyandırmaqda,
Şənliyi qeyb eləyib həzzi dayandırmaqda,
Göz yaşım qarə daşı rəngə boyandırmaqda,
Yardən başqa bir adəm məni şənləndirməz.

Bu sevən təntənələrdən elə ikrah edəcək,
Sanıram daima şivən qoparıb ah edəcək,
Şahini şadiman etsə fəqət Allah edəcək,
Yardən başqa bir adəm məni şənləndirməz.

*29.05.2001*





## QƏZƏL

Ərz edə bilməyəcəkdir daha dil yarə "Salam",
Gedibən çatmayacaq sevgili dildarə salam.

Salam ey dar ağacı, şairi qaldır yuxarı,
Kəndiri yağlayaraq söyləyirəm darə: Salam.

Mən ki illər boyu nikbin yaşayan insandım,
Əhdə "alqış" demişəm daima, ilqarə "salam".

İndi ən bədbin olan bəndəsiyəm dövranın,
Nə şaha dil deyəcəkdir, nə də sərdarə "salam".

Rəngi vardır salamın, sanki bütün dünyayə
İltifat eyləməyib ağ - deyirəm qarə salam.

Niyyətim vardı yonum heykəlini Şahdağda,
Şirinim, verməyəcəksən daha memarə salam.

Torpaq altında gedibsən əbədi bir yuxuya,
Torpaq üstündə bitən güllərə, otlarə salam.

"Şahinim tapmadı çarə" deyə küsdün getdin,
Gələrəm yanına şövq ilə, a biçarə, salam!

*30.05.2001*

## EY QARA RƏNGİ SEVMƏYƏN!

Vədələşmişdik dünəndən,
Gəldik məzarının ziyarətinə
qızın Ülviyyə,
nəvən Sevda
və mən.
İsti idi,
hava yanırdı sanki.
Cismin üstə
qalaqlanan torpağı görcək
bizim də
bağrımızın başı yandı,
gözlərimizin yaşı yandı,
məzarına
mirvari damcılandı,
çünki qara olmur mirvari,
çünki sən
sevmirdin qara rəngi...

Ey qara rəngi sevməyən,
bəs hicran qara,
fəraq qara deyilmi?



Uyuduğun
torpaq qara deyilmi?
Bundan belə həyatım
sənsiz qara deyilmi?
Gecə onsuz da qaradır,
gündüz qara deyilmi?
Bundan belə
gecə düşəndə
yandırmayacağam çırağı,
qaranlıq qoy qara qalsın,
qaranı sevmirdin axı...
Bundan belə
görən olmayacaq daha
mənim parlaq günümü,
Qaranı sevməyə-sevməyə
qaraltdın ağ günümü,
Pərişan etdin halımı.
Mənsə
Sən sevinəsən deyə
Qara rəngi sevmədiyinçin
Hələ gəncliyimdə ağartmışdım
qapqara saç-saqqalımı...

*31.06.2001*

*34-cü gün*

## QƏZƏL

Gəldi qış fəsli, baharım yoxdur,
Nərgizim soldu, çinarım yoxdur.

Bir də səslənməyəcəkdir nəğməm,
Mizrabım sındı və tarım yoxdur.

Qapısında daha şənlik bağının
Var qıfıl, amma açarım yoxdur.

Məni sən öylə pərişan elədin,
Hövsələm, səbrü qərarım yoxdur.

Ölüyəm, amma nə olsun ki bu gün
Torpaq altında məzarım yoxdur.

Əcələ yalvarıram tez gəlsin,
Daha bir zərrə vüqarım yoxdur.

Bir bədəndə neçə min dərdim var,
Şahina, getdi o yarım, yoxdur.

*1.06.2001*



*35-ci gün*

## ŞAHİN BAXIŞLARIM ARDINCA BAXIR

Daha iztirabım, dərd-ələmlərim
Yerləşmir dəftərə, sığmır kitaba.
Acı kədərlərim, ağu qəmlərim
Təsbeh dənəsi tək düzülüb sapa.

Həzin layla çalır qəlbimin simi,
Ürək - bəstələyir, könül - bəsləyir.
Hərdən unuduram sənsizliyimi,
Dilim "çay süz" deyib səni səsləyir.

Bu dünya mənimçin bir əfsanədi,
Daha iqbalımı daşa vurmuşam.
Mən bir də bilmərəm məhəbbət nədi,
Məhəbbət dərsimi başa vurmuşam.

Özünlə apardın sevda dünyamı,
Dünyam sənlə getdi, dünyasızam mən.
Qar kimi əridi ömrümün şamı,
Düşdün yer altına yerin üstündən.

Daha eşq qəlbimdə eləməz səda,
Gözüm çiçəyi də tikan sanacaq.
Əlim eşq gülünə açılmasa da,
Ayağım həmişə tikanlanacaq.

Ürəyim kimsənin eşqinə yanmaz,
Sevda qapısını qapamısan sən.
Amma "gəl" deməkdən dilim usanmaz,
Amma, nə faydası, uçdun əlimdən.

Özün də tək qaldın məni tək qoyub,
Şahin baxışlarım ardınca baxır.
Sənin göz yaşların daha quruyub,
Mənim göz yaşlarım hələ ki axır...

*2.06.2001*



*16-cı gün*

## QƏZƏL

Dağılıb getdi qəmin, sən qəmi tərk eyləmisən,
Çünki, qəm mülkü olan aləmi tərk eyləmisən.

Gözümü nəmli edibsən gözü ey nəmli olan,
Tərk edib nəm səni, ya sən nəmi tərk eyləmisən?

Əfqanıstan və İran içrə izin qalmışdır,
İndi qoydun bizi tək, ölkəmi tərk eyləmisən.

Göyçaya dəyməyəcəkdir qədəmin, həm də mənim,
"Quba" ismində olan qibləmi tərk eyləmisən.

Mənə məhrəm sən idin ey məni xoşbəxt eləyən,
Sənə məhrəm mən idim, məhrəmi tərk eyləmisən.

Musiqi səsləri varmı o biri dünyadə?
Sən bu dünyadə "Şur"u, "Dilqəm"i tərk eyləmisən.

Orda Zəmzəm suyunun zümzüməsi vardırmı?
Burda Qəçrəş suyu tək Zəmzəmi tərk eyləmisən.

Sözlərimdə azacıq varsa küfr, ey Həvva,
Demərəm bir də sənə Adəmi tərk eyləmisən.

Sən ki qəlbimdə yaşarsan bu səbəbdən də məni
Həmi tərk etməmisənsə, həmi tərk eyləmisən.

Sənə həmdəm daha yoxdur, mənə həm həmdəm yox,
Niyə Şahin kimi bir həmdəmi tərk eyləmisən?

*3.06.2001*

## MƏLƏKLƏR NƏ DEDİ SƏNƏ?

Qəbrin üstdə küləklər var,
Küləklər nə dedi sənə?
Torpağında böcəklər var,
Böcəklər nə dedi sənə?

Qəm qamışdı, tütəklədi,
Gedişin məni təklədi...
Məzar nə tez çiçəklədi,
Çiçəklər nə dedi sənə?

Vüsal ömrü... hicran ömrü...
Fərəh ömrü... fəğan ömrü...
Ələklənir insan ömrü,
Ələklər nə dedi sənə?

Nə mey qaldı, nə cam qaldı,
Nə pərvanə, nə şam qaldı,
Diləklərin nakam qaldı,
Diləklər nə dedi sənə?



Ruhun yerdən gedən oldu,
Səma ona vətən oldu,
Libasın bez kəfən oldu,
İpəklər nə dedi sənə?

Bu dünya ağ, qara tüstü,
Təzək - altı, bəzək - üstü...
Yatağın daş-kəsək üstü,
Döşəklər nə dedi sənə?

Hər kəs, deyil axı bu sirr,
Əcəl meyi içəcəkdir.
Şahin haçan köçəcəkdir,
Mələklər nə dedi sənə?

*4.06.2001*

*38-ci gün*

## QƏZƏL

Çıxıb getdin əzab ilə yanıb pərvanə-pərvanə,
Fərar etdin baxıb loğmanlara biganə-biganə.

Məqamın bərqərar olsun behişt içrə sənin, çünki
Ömür sürdün bu dünyadə hər an mərdanə-mərdanə.

Mənəm Məcnuni dövranın, fəqət yoxsan sən, ey Leyli,
Gözüm qəbrində qalmışdır bu gün divanə-divanə.

Sözüm dalğın, özüm məhzun, üzüm solğun, gözüm çeşmə,
İnan, aləm görünməkdə mənə qəmxanə, qəmxanə.

Yadımdan çıxmayır bir dəm şirin söhbət ki eylərdin,
Səpərdin üstümə sözlər mənim dürdanə-dürdanə.

Qızın Ülviyyə insandır, inan, ülviyyə-ülviyyə,
Qızın Şahanə sultandır mənə şahanə-şahanə.

Çox əfsanə yazılmışdır sevən kəslərdən, ey Şahin,
Bizim eşq həm olar bir gün bəyan əfsanə-əfsanə.

*5.06.2001*



*39-cu gün*

## YER ALTI SOYUQDUR, DONUBSAN YƏQİN...

Dünən şadimandım, bu gün zaram mən,
Bu günün dünəndən fərqi olubdur.
Varlıq dənizində yarım üzərkən,
Həyat gəmisinin qərqi olubdur.

Bitdi ömür yolu, qoydu məni tək,
Qismət qəbirdir, payım fəraqdır.
Mənim ömür yolum bitməyənədək,
Dərdli şerlərim yazılacaqdır.

O al vüsal gülüm daha açılmaz,
Hicran göyərmədə əvəzindəsə.
Fələyin qurduğu qəza qaçılmaz,
İnsafı olmayıb onun heç kəsə.

Əbədi qonağım elədim yası,
Bir daha sevincim güllənməyəcək.
Hər qoca kişinin yetim qalması
Acıdır hər uşaq yetimliyi tək.

Acıyır halına bu qəmli Şahin,
Qəzadır... bir kömək gəlmir əlindən.
Yer altı soyuqdur, donubsan yəqin,
Yer üstdə qar kimi əriyirəm mən.

*6.06.2001*

## ÖMÜR KİTABIM

Ömür kitabımın mütaliəsi
Məni çəkdi hara, apardı hara -
Ömür kitabımın varaqlarının
əvvəli ağdı,
ortası yaşıldı,
axırı qara.

Əvvəli hələlik yaşıllaşmayan
və qaralmayan
ağ səhifəsi -
qayğısız, kədərsiz çağ səhifəsi;

Ortası
çox yerə səfərlə dolu,
uğur ilə dolu, zəfərlə dolu
inkişaf yolu;

Axırı
ömrümün tənha anları,
itkili anları, həyəcanları...

Ömür kitabımın səhifələri
üç fəslə bölünüb oldu üç para:
Əvvəli ağdı,
ortası yaşıldı,
axırı qara...

*7.06.2001*





## QƏBRİMİN İÇİNDƏ AĞLAMAQ ÜÇÜN

Kəbədə şeytana daş atmağım var,
Cibimdə pul deyil, daş saxlayıram.
Ölüb həyatımı yaşatmağım var,
Mən bu niyyət üçün baş saxlayıram.

Ey ilahi varlıq, ey əbədi nur,
Rəbbim, mənzilimi cənnətində qur.
Altmış ildir ki, ömür qoruyur,
Sinn tumarlayıram, yaş saxlayıram.

Həzzdən çox kədəri pay eləsə də,
Ox kimi qəddimi yay eləsə də,
Dəmir ürəyimi zay eləsə də,
Dərdimi etməyib faş, saxlayıram.

Vüsal gəzirsənsə sən fəraq üçün,
Ağla ölü üçün, ağla sağ üçün.
Qəbrimin içində ağlamaq üçün
Gözümün içində yaş saxlayıram.

*8.06.2001*

*43-cü gün*

## QƏZƏL

Çıxıram dağə küləklər gözə görsənmirlər,
Düşürəm bağə çiçəklər gözə görsənmirlər.

Ya mənim gözlərimi pərdə tutubdur, ya da
Qeyb olublar kəpənəklər, gözə görsənmirlər.

Nə üçün yasəmənin ətrini hiss eyləmirəm?
Niyə hillər və mixəklər gözə görsənmirlər?

Niyə çöllərdə çobanlar gözümü cəlb eləmir?
Niyə neylər və tütəklər gözə görsənmirlər?

Hanı ətrafda gözəllik ki, görünməkdəydi,
Niyə əvvəlki bəzəklər gözə görsənmirlər?

Canavarlar kimi yadlar daraşıb torpağıma,
Nə üçün bəs dəyənəklər gözə görsənmirlər?

Çox dilək var idi qəlbimdə, göyərməkdəydi,
Niyə, ey Tanrı, diləklər gözə görsənmirlər?

Yarı görmək diləyən Şahinə göydən birdən
Gəldi bir səs ki, "Mələklər gözə görsənmirlər".

*10.06.2001*



*45-ci gün*

## MƏNİM ÜMİDİMİN KÖYNƏYİ YAŞDIR...

Yara istəyənə dərman nə gərək,
Ölüm istəyənə loğman nə lazım?
Fəğan edəcəyəm son günümədək,
Aşkar edəcəyəm, pünhan nə lazım?

Gündüzüm həyəcan, gecəm təlaşdır,
Tükəndi taqətim, qaldı quru can.
Mənim ümidimin köynəyi yaşdır,
Daha o köynəyi yoxdur qurudan.

Sənin gülüşlərin, təbəssümlərin
Sevinc bəxş edərdi bizim sevgiyə.
Bəlkə də gizləndin altında yerin,
Mən səni pərişan görməyim deyə.

Çiçək əvəzinə, gül əvəzinə
Üstünə yağmada gözümün yaşı.
Fəda eləmişdim başımı sənə,
İndi əvəz edir başı baş daşı.

Açа bilməyirəm qəlbi heç kimə,
Sən tək duya bilməz məni kimsənə.
Elə halsızam ki, mənim yerimə
Qoy yellər danışsın halımı sənə.

Daim dinləyirəm könül səsini,
O səs eşidilir meylimə rəğmən.
Bağlayıb məhəbbət dərvazəsini,
Sevda qapısını qapamışam mən.

Sanmayın açıla, bu qapı sına,
Bir də qəlb evimdə qalanmaz ocaq.
Gözəllər "aç" desə, eşq qapısına
"Yox" qıfılı vursam, açılmayacaq!

*12.06.2001*



*47-ci gün*

## QƏZƏL

Ruhinin cilvəsi, ey gül, nəzər istər məndən,
Cilvəni vəsf eləməksə hünər istər məndən.

Eşqi öyrənmədəyəm tazə nəzərlərlə daha,
Bixəbərlər gecə-gündüz xəbər istər məndən.

Ağlamaq istəyirəm, amma qəhərlənməyirəm,
Göz yaşım çıxmayacaqdır, qəhər istər məndən.

Dikmişəm asimana mən neçə gündür gözümü,
Hanı göyqurşağı, yarım kəmər istər məndən.

Mənə gəlsin deyə ilham, gözəlim, gəl yanıma,
Təbimin tutisi hər gün şəkər istər məndən.

Qoymayıbdır acı hicran ürəyimdən bir əsər,
Doymayıbdır hələ, indi ciyər istər məndən.

Gözünü yumduğu ləhzə yaramı açdı o yar,
Dözməyə yoxluğa qüvvət, təpər istər məndən.

Cənnəti görmədəyəm, Şahina, tez-tez yuxuda,
Deyəsən həzrəti-Allah səfər istər məndən.

*14.06.2001*

*49-cu gün*

## QƏZƏL

Sən ki yoxsan, bu gün aləmdə mənə xoş dəm yox,
Elə zənn eyləyirəm mən ki bu dəm aləm yox.

Mənə Zəmzəm suyu təklif eləyibdir bir hacı,
Mənə Qudyal suyu lazımdı bu gün, Zəmzəm yox.

Ey əql sahibi Məcnun, bu dünyadə səni
Kim dəli bildisə ondan dəli bir sərsəm yox.

Gözümün yaşı ilən doldu ləyənlər evdə,
Bu səbəbdən də gül üstündə bu gün şəbnəm yox.

Dostlarım var idi hər yerdə, bu saatdə isə
Nə mənə munis olan var, nə də bir həmdəm yox.

Hamı yatmış, edirəm bayquş ilən söhbət mən,
Neyləyim ki, mənə məhrəmlik edən adəm yox.

Üzü ağ, alnı açıq olmalısan, ey Şahin,
Başı düz saxla, papaq olsa da əyri, qəm yox.

*16.06.2001*



*51-ci gün*

## QƏZƏL

Yarəb, məni az qalmış hicrin dağı öldürsün,
Heç qarə rəvadırmı cumsun ağı öldürsün?

Öldürmüşəm hicranı yoxdur buna heç şəkkim,
Mümkünmü ölü qalxıb bir gün sağı öldürsün?

Torpaqdan olub Adəm, torpaq - əli xəlq etmiş,
Var qorxu ki bir vədə əl torpağı öldürsün.

Birlik hanı müslimdə, yox şübhə ki, kafər yox,
Məmmədmusanı bir gün Məmmədtağı öldürsün.

"Sağ" ilə "sol"un cəngi... Var ehtimalım, bir gün
"Sağ" qoymaya can "sol"da, "sol" həm "sağ"ı öldürsün.

Mənsə yaxamı çəkdim hər vədə siyasətdən,
Arif diləməz hətta bir yarpağı öldürsün.

Tərk etdi məni yarım... Axşam çağıdır indi,
Rəbbim məni lütf etsin axşam çağı öldürsün.

Şahin, nə qədər sağsan yetməzsən axı vəslə,
Varmı elə qatil ki, sən müştağı öldürsün?

*18.06.2001*

53-cü gün

## SAĞOLLAŞMADAN ÖLƏCƏYƏM...

Dərələr keçmişəm,
təpələr,
dağlar aşmışam,
Sənlə çox sağollaşmışam.
Bakıdan çıxıb
başqa şəhərlərə gedərdim,
sağollaşardım,
Daxili,
xarici
səfərlərə gedərdim,
sağollaşardım.
Səni
bir saatlığa tərk edəndə də
sağollaşardım,
Bəzən yuxuya gedəndə də
sağollaşardım.
O sağollaşmalar
sağ saxlayırmış bizi,
O sağollaşmalar
yaşadırmış, göyərdirmiş
yenidən salamlaşma ümidimizi.
Amma,
təkrar-təkrar görüşərik yenidən
Sən və Mən.

Sağ olmağına,
mən yanına dönənə qədər



sağ qalmağına
inam vardı canda,
sağollaşardım,
Dalımca su atsan da,
atmasan da,
sağollaşardım...

Bir gün,
nəhs bir gün
sağollaşma bitdi,
Çünki
o gün ümidim göyərmədi,
soldu, soldu, səninlə getdi.
özünlə apardın ümidimi,
buna görə də
Səninlə
sağollaşmayacağam daha,
Allah qoysa
salamlaşacağam
tamarzın kimi.

Ruhun oyaqsa,
məni eşidirsənsə,
dinlə:
Bu dünyada yoxsan deyə,
Səninlə sağollaşmadan öləcəyəm
Və
əbədi salamlaşmaq üçün
yanına gələcəyəm!..

*20.06.2001*

55-ci gün

## AY HARAY!..

Qadınımdı, getdi tək,
Əri qaldı, ay haray!
Əldən uçdu kəpənək,
Zəri qaldı ay haray!

Kül oldu közü yoxdur,
Əksi var, sözü yoxdur.
Yerində özü yoxdur,
Yeri qaldı, ay haray!

Anıb qəbiri getdi,
Arzusu diri getdi,
Sevənin biri getdi,
Biri qaldı, ay haray!

Qoymadı məhəl mənə,
Uzatmadı əl mənə,
Çatmadı əcəl mənə,
Geri qaldı, ay haray!

Şüası yox günə bax,
Oldusa da sinədağ,
Vəfasız Şahinə bax,
Diri qaldı, ay haray!

*22.06.2001*



56-cı gün

## İKİ BAYATI

Həzzi bitirdi Şahin,
Cüt deyil, birdi Şahin.
Yalqızlığı taparaq
Yarı itirdi Şahin.

Ələkdən,
Keçirməyir ələk dən.
Fələk belə zülm etsə,
Keçəcəyəm ələkdən.

58-ci gün

## TABUT OLDU MƏNİM SİNƏM...

*(Gəraylı)*

O təbibdə qayçı, bıçaq,
Bu loğman zəli gəzdirir.
Bu gedən ağıllıya bax
Yanında dəli gəzdirir.

Sirri saxlayan dil imiş,
Sirdaş işi müşkil imiş,
Suyun həmrahı gil imiş,
Suya bax, gili gəzdirir.

Ürək öldü... Gözümdə qəm...
Ölü güldü: - Mən səninəm!
Tabut oldu mənim sinəm,
İçində ölü gəzdirir.

*25.06.2001*

*61-ci gün*

## ÜÇ BAYATI

Sanmayın nahaqdadır,
Taleyimiz haqdadır.
Yar uçdu asimana,
Şahinsə torpaqdadır.

Aşiqin gözü qəmli,
Torpağın üzü nəmli.
Dünya beşgünlük imiş,
Dördü onun ələmli.

Göz aradı yasəmən,
Haradadı yasəmən?
Baharım qışa döndü,
Çünki batdım yasə mən.

*28.06.2001*



*63-cü gün*

## QƏZƏL-TƏZMİN

"Ayineyi-ruyində çün oldu kədər peyda,
Vəhm eyləginən, oldu ahimdə əsər peyda". *

Torpağə verib təhvil döndümsə də, ey dilbər,
Qəbrində gözüm qaldı, ardınca nəzər peyda.

Artıq başa düşdüm ki, şirinliyi ömrün yox,
Qəti əmin oldum mən bal içrə zəhər peyda.

Sən qəbrə gedən gündən dolmuş canıma qüssə,
Sən qəbrə gedən dəmdən qəlbimdə qəhər peyda.

Ahim sənə yetmirsə nələm barı qoy çatsın,
Ahimdə nələr məlum, naləmdə nələr peyda.

Torpağə qarışsan da, gözlə, gəlişim gerçək,
Mən növbədəyəm artıq, yol bəlli, səfər peyda.

Gəldik, yaşadıq, getdik, ey gəldigedər insan,
Xeyr içrə ziyan hasil, faydadə zərər peyda.

Bağbanı izn versə Şahin də gələr dərhal,
Yarım, arada indi, əlbəttə, çəpər peyda.

*30.06.2001*

---

* Beyt Mirzə Ibrahim Səbahındır (XIX əsr)

*65-ci gün*

## QİTƏ

Ey məzar içrə yatan yar, elə zənn eyləyirəm,
Yönü dərdin, kədərin tək mənədir vallahi.

Qızlarım qədrimi bilməkdədi əvvəlki təki,
Ehtiyacım sənədir, tək sənədir vallahi.

Diləyimdir sən olan yerdə tutam öz yerimi,
Bu cahan sanki mənə məngənədir vallahi.

*2.07.2001*

*67-ci gün*

## QƏZƏL

Elə ki, görməyəcəkdir gülü bundan sonra,
Bülbülün lal olacaqdır dili bundan sonra.

Ey fələk, sən ki ürək mülkümü bərbad elədin,
Ürəyin yoxdu demək mənzili bundan sonra.

Daha saf olmayacaq bir də ümid dəryası,
Yığacaq sahilə dərya gili bundan sonra.

Bir gedərgəlməz olan məskənə getmiş sevgim,
Geriyə dönməyəcək sevgili bundan sonra.

Mənə bayram daha yoxdur, mənə matəm vardır,
Olmaram təntənənin maili bundan sonra.



Gözlərim seyr eləmək istəməyir gülzarı,
Yeridin gözlərimə tez mili bundan sonra.

Qəm səpib qüssə əkibdir deyə Şahin Fazil,
Qəlbinin dərd olacaq hasili bundan sonra.

*4.07.2001*

*69-cu gün*

## QƏZƏL

Məndən elə ki sevgili canan aralandı,
Cismim paralandı, elə bil can aralandı.

Əfv eyləmək olmaz, bilirəm, var isə nöqsan,
Bir zərrə məgər gördümü nöqsan, aralandı.

Sultanı camalın o idi, mərifətin mən,
Sultanə hayan olmadı sultan, aralandı.

Həmdərd idi, hər dərdimi guya çəkəcəkdi,
Biçarə görüb xəstəni loğman aralandı.

Kafərlərin əlbirliyi, dilbirliyi məlum,
İncitdi müsəlmanı müsəlman, aralandı.

Meydanını vəslin dağıdır toppuzu hicrin,
Toppuz elə bərk dəydi ki, meydan aralandı.

Gül kimsəni zar etmədi, hər bülbülə baxdı,
Gülzardə görcək bunu bağban aralandı.

Mən xəlqi qəzəl yazmağı təlqin elədikdə
Tərk etdi qəzəlxanı qəzəlxan aralandı.

Qartal uçuşu bir çoxuna olmadı qismət,
Pərvazımı görcək neçə nadan aralandı.

Birləşdi kədər dərd ilə, Şahin, bizə gəldi,
Məndən elə ki sevgili canan aralandı.

*6.07.2001*

*71-ci gün*

## QƏZƏL

Ömürlük intizarım var, həyatım indi zar onsuz,
Əlimdən almasın kimsə, mənimdir intizar onsuz.

Əsər yoxdur, əlamət yox əzəlki bəxtəvərlikdən,
Qürurum qeybə çıxmışdır, tükənmişdir vüqar onsuz.

Yaxam tənhalığın cəngində qalmışdır, əlacım yox,
Qədərsiz iztirabım var, əzabım çağlayar onsuz.

Nə səbrim var dözüm dərdə, nə dözməkçin qərarım var,
Səbrsizdir səbr, yarəb, qərarsızdır qərar onsuz.

Mənim bədbinliyimdən olmasın bədbin bu gün dostlar,
Büsatə, şənliyə, həzzə yoxumdur ixtiyar onsuz.

Meyindən içmərəm bir də, sözümdən incimə, saqi,
Əlimdə badə yoxdursa, dilimdə nalə var onsuz.

Sönübdür ay da, ulduz da, batıbdır sanki gün göydə,
Ağarmış saqqalım, Şahin, qaralmış ruzigar onsuz.

*8.07.2001*



*74-cü gün*

## QƏZƏL

*Tamridanın məzarı önündə*

Görmürəm mən neçə andır səni, ey yar, görün,
An nə miqdar görünə bilsə o miqdar görün.

İnsan öldükdə görünməz, o görünmək əməli,
Gələcək görsənişə qoy ola meyar, görün.

Demirəm indi görün, amma ümidvar eylə,
İynənin lap ucu boyda gər ümid var görün.

Xeyli əsrarı Xudavəndimizin gizli qalıb,
Bilirəm, yerdə də var, göydə də əsrar, görün.

Nə gülüstan həvəsim var, nə də gülşən şövqüm,
Məni sənsiz çəkə bilmir nə də gülzar, görün.

Görmüşəm mən sənin illər boyu sağlam gününü,
Eybi yox, gözlərimə sən elə bimar görün.

Şahinə bəlli: Mələklər gözə görsənməz olur,
Gözə görsənməməyi eyləyib inkar, görün.

*11.07.2001*

*77-ci gün*

## QƏZƏL

Qəmimi, dərdimi başdan çıxara bilməyirəm,
Qəlbimi qüssə-təlaşdan çıxara bilməyirəm.

Geydirən var qəzələ əcnəbi cındır paltar,
Qəzəli mənsə qumaşdan çıxara bilməyirəm.

İstilah uydurulub saxta - Qulaq qafiyəsi...
"Qaş"ı "daş"dan, "daş"ı "qaş"dan çıxara bilməyirəm.

Şəmə pərvanə yanır, amma çıxarmır səsini,
Səsimi mənsə yavaşdan çıxara bilməyirəm.

Gözlərim göz yaşı dəryaçəsinə oldu girinc,
Onları mən hələ yaşdan çıxara bilməyirəm.

Sən gedəndən bürüyüb qar kimi saqqal üzümü,
Üzü, ey yar, təraşdan çıxara bilməyirəm.

Qəm cumur, qüssə cumur üstümə, Allah deyəcək:
"Şahini dava-dalaşdan çıxara bilməyirəm".

*14.07.2001*



*83-cü gün*

## QƏZƏL - TƏZMİN

*"Çəkib hər bir tərəfdən üstümə ləşkər qəza fövcün,*
*Yığılmış xani-yəğma tək dəmadəm hər nə var, artar".*
**Məşədi Mürtəza Qarabaği (XIX əsr)**

O gündən ki evin olmuş qəbir, məndə qübar artar,
Gün ötdükcə, ay ötdükcə canımda ahuzar artar.

Məzarını ziyarət eyləmək istər ürək hər gün,
Gücüm, qüvvəm azaldıqca ayağımda qabar artar.

Qarışmaqda sənin cismin bu gün torpağə tədricən,
Saraldıqca qara zülfün, mənim zülfümdə qar artar.

Sənin rəftarını andıqca rəftarım düşür gözdən,
Sənin əxlaqını yad eylədikcə iftixar artar.

Mənəm tənha bu gün yerdə və göydə Allahım tənha,
Nə miqdar ömr azaldıqca o miqdar intizar artar.

Qəmimdən şad olur könlüm ki vəslim sənlə olsun tez,
Canımda qəm çoxaldıqca vücudimdə azar artar.

Darıxma, Şahin ilə Nazilə Fazil də can versə,
Solunda bir məzar artar, sağında bir məzar artar.

*20.07.2001*

*86-cı gün*

## VERİN O ADAMI MƏNƏ

Demirəm ki, adam yoxdu,
Verin o adamı mənə.
Yer üzündə adam çoxdu,
Verin o adamı mənə.

Verdiyini, eyvah, aldı,
Qəfil gəldi, nagah aldı,
O adamı Allah aldı,
Verin o adamı mənə.

Həzz itdi, əfğan böyüdü,
Hicrana meydan böyüdü.
Aman, qəbristan böyüdü,
Verin o adamı mənə.

Qırılan çox dilək qoydu,
Yarılan bir ürək qoydu.
O adam məni tək qoydu,
Verin o adamı mənə.



Mərizdim, loğmanım idi,
Hər yerdə dərmanım idi,
Canım öldü, canım idi,
Verin o adamı mənə.

Qaranlıq çökdü, şamsızam,
Sabahıma inamsızam,
Ay adamlar, adamsızam,
Verin o adamı mənə.

Bir Şahinəm sözümdə qəm,
Üzümdə dərd, gözümdə nəm.
Başqasını istəmirəm,
Verin o adamı mənə.

*23.07.2001*

*89-cu gün*

## QƏZƏL

Bu nə hicrandı gəlib heç nədən ar eyləməyir,
Bu nə kəsdir daha sevdanı şüar eyləməyir?

Necə aşiqdi bu aşiq ki vüsal arzulamır,
Həzzi qoymur yaxına, dərdi kənar eyləməyir.

O nə oddur ki, onun qəlbini odlandırmır,
O nə güldür onu ətriylə xumar eyləməyir?

Boşalıbdır qapısı öylə kilidlənmiş ki,
Qəfəsində canının eşq qərar eyləməyir.

Onu xar etmədə göz yaşı da, yaddaş da bu gün,
Təkcə təb oldu ki bir dəm onu xar eyləməyir.

İtirəndən bəri dildarını batmış yasə,
Amma aşiq dəxi var qəlbi qübar eyləməyir.

Uyu asudə məzarında bu gün, ey yarım,
Qəlbinə heç kimi Şahin daha yar eyləməyir.

*26.07.2001*



*91-ci gün*

## ƏLİM ÇATMAYIR SƏNƏ

*Musa peyğəmbər öz əsalı əlini hər kəsə,*
*dünyanın harasında olsa belə çatdırardı...*

Ürəyimdə qübar var,
Əlim çatmayır sənə.
Aramızda hasar var,
Əlim çatmayır sənə.

Tamarzı tək, ac kimi,
Sənə yalavac kimi,
Uzadıram əlimi,
Əlim çatmayır sənə.

Bu odun közü qara,
Bu közün gözü qara.
Əlimin üzü qara,
Əlim çatmayır sənə.

Fələyin yüz dərdi var,
Ürəyin söz dərdi var,
Əlin də öz dərdi var,
Əlim çatmayır sənə.

Hicran qısa olaydı,
Şahin Musa olaydı,
Əlim əsa olaydı,
Əlim çatmayır sənə.

*28.07.2001*

## SABAHKI HALIMA VAY

Bu aşiq bihal düşüb,
Qara iqbalıma vay.
Ürəyimə xal düşüb,
Ürəkdə xalıma vay.

Ağrıya, acıya bax,
Mənə kim acıyacaq?
Gələndən bəri fəraq
Şirin vüsalıma vay.

Gedib o qaragözlüm,
Təkliyə necə dözüm?
Gərək öləydim özüm,
Arzu-xəyalıma vay.

Arzum, xəyalım belə...
Qəmim, məlalım belə...
Bugünkü halım belə,
Sabahkı halıma vay.

*30.07.2001*





## QƏZƏL

Məni Rəbbim dəlilər silkinə sultan elədi,
Çünki əqlim neçə divanəni heyran elədi.

Özü cənnətdədir, amma məni zillətdə qoyub,
Mənə zülmü neçə gündür ki, o canan elədi.

Əlimizdən çıxıb indi o firavanlığımız,
Neyləmişdik fələyə zülmü firavan elədi.

O qonaqdı bu cahan içrə, qonaqlıq bitdi,
Onu bir başqa məkan indisə mehman elədi.

Nə əlac eşqdən oldu, nə dəva sevdadən,
Nə təbib çarəni tapdı, nə də loğman elədi.

Var ümidim ki, bizi bir daha birləşdirsin,
Bəlkə Allah-təala yenə imkan elədi.

Yarı tək, Şahini tək qoydu o tək Allahım,
Bir canı yox, o biri canı yarımcan elədi.

*2.08.2001*

*97-ci gün*

## QƏZƏL

Düşünürdüm ki, qübarım, qəhərim bitməkdə,
Nə biləydim axı tabım, təpərim bitməkdə.

Yenə gördüm ulu Allahı bu gün röyadə,
Söylədim: - Rəhm elə, şirnim, şəkərim bitməkdə.

Dedim: - Ey Tanrı, neçin məndən ayırdın o gülü?
- Aranızda, - dedi, - şair, çəpərim bitməkdə.

Ağladım halıma, açdım gözümü, gördüm ki,
Qələmim düşmüş əlimdən, hünərdən bitməkdə.

Yarımı görməyə getdim darıxıb... Güllər yox,
Qəbri üstündə mükəddər kədərim bitməkdə.

Bir zaman barlı ağac idi bu şair, əfsus,
Bəhərim bir də görünməz, səmərim bitməkdə.

Qanadım get-gedə sustalmadadır, ey Şahin,
Qoca dünyayə mənim həm səfərim bitməkdə.

*4.08.2001*



*103-cü gün*

## QƏZƏL

Görmür yaşamaqda daha məna qoca Şahin,
Çünki düşüb əldən qoca dünya, qoca Şahin.

Yoxsan deyə sən vəslini bir qeyri nigarın,
Etməz daha ömründə təmənna qoca Şahin.

Çoxdandı yaranmır yeni dərya, elə zar ki,
Bir gün yaradar bir yeni dərya qoca Şahin.

Hərçənd azalmaqda ömür günləri, amma
Gündən-günə artırmada misra qoca Şahin.

Röyadə görərdi səni, ey yar, həmişə,
Yatmır deyə görmür daha röya, qoca Şahin.

Sevdalı olan başına daş öylə düşüb ki,
Etmir neçə müddətdi ki sevda qoca Şahin.

Bir ah çəkib yer kürəsin partladacaqdı,
İnsanlara rəhm eylədi amma qoca Şahin.

*10.08.2001*

## QƏSİDƏ

*Bu gecə yuxuda Tamridanı gördüm.*
*Sağ idi, lakin məndən uzaq idi...*

Hara getdin belə, ey yar ki, yoxdur xəbərim,
Bu xəbərdən xəbərin var ki, yoxdur xəbərim?

Qəlbimə həzz idi, şənlikdi, sevinc idi qonaq,
Hara qaçmış o qonaqlar ki, yoxdur xəbərim.

Qocaman Şahdağa baxdım, necə məhzun idi...
Dağladı sinəmi dağlar ki, yoxdur xəbərim.

Kəbə görsəndi və Mina dağı görsəndi mənə,
Yaxın olmuşdu uzaqlar ki, yoxdur xəbərim.

Ağ ötən günlərimin yoxdu qəradən xəbəri,
Qaraya dönmədə ağlar ki, yoxdur xəbərim.

Biz ki bağlarda gəzib birgə çiçək bağlardıq,
Üzümü danladı bağlar ki, yoxdur xəbərim.

Vermədi buz bulaq üstündəki qızlar mənə su,
Çatladı, yandı dodaqlar ki, yoxdur xəbərim.



Durmuş idim ağac altında, külək başlandı,
Başıma döydü budaqlar ki, yoxdur xəbərim.

Evə döndüm, evim olmuşdu qara bəxtim tək,
Büsbütün keçdi çıraqlar ki, yoxdur xəbərim.

Qələmim yazmadı bir kəlmə, mürəkkəb qurudu,
Yenə ağ qaldı varaqlar ki, yoxdur xəbərim.

Üzümü bir neçə yerdən yenə ülgüc kəsdi,
Saçımı yoldu daraqlar ki, yoxdur xəbərim.

Ürəyimdən acı, zəqqum təki şivən qopdu,
Titrədi, əsdi yanaqlar ki, yoxdur xəbərim.

Ağladım, taqətimi, səbrimi Allah kəsdi,
Əlimi kəsdi bıçaqlar ki, yoxdur xəbərim.

Xəbər olsaydı yerindən yerim olmazdı bura,
Gözlərim hey yenə ağlar ki, yoxdur xəbərim.

Yerə dəycək ayağım, Şahina, yer titrərdi,
Qüvvədən düşdü ayaqlar ki, yoxdur xəbərim.

*12.08.2001*

*109-cu gün*

## ÖLÜM GƏLMƏDİ, GƏLMƏDİ...

Fələk yenə göndərdi qəm,
Gülüm gəlmədi, gəlmədi.
İstədim qarğış eləyəm,
Dilim gəlmədi, gəlmədi.

Hərdən dursa da qəsdimə,
Hicran bələndi tüstümə.
Elə közəm ki, üstümə
Külüm gəlmədi, gəlmədi.

Sərt bir dağam, ovulmadım,
Kimsəyə mane olmadım,
Qətrəyə qane olmadım,
Selim gəlmədi, gəlmədi.

Gözümdən yaş axa-axa,
Çalışmışam yaşatmağa...
Heç quşa da daş atmağa
Əlim gəlmədi, gəlmədi.

Hamıya meydan oxuyan,
Nə bezikən, nə də doyan.
Şahini pis günə qoyan,
Ölüm gəlmədi, gəlmədi.

*16.08.2001*



*113-cü gün*

## QƏZƏL

Mən susum, dərdimi yarə, kədərim, sən söylə,
Söylə "qan olmada onsuz ciyərim", sən söylə.

Bu fəna aləmə yarın səfəri bitmişdir,
De ki "bitməkdə mənim həm səfərim", sən söylə.

Gecənin çadrasına yer bürünür qüssəylə,
Söylə "hüzn ilə gəlir hər səhərim", sən söylə.

Çıxmışam mən fələyin hər sınağından üzüağ,
Qaralıb indisə tabım, təpərim, sən söylə.

Mən desəm, bədnəzərin bəd nəzərindən ölləm,
Yarımı gəzmədə hər gün nəzərim, sən söylə.

Bir soruş mollaların hər biri cənnətlikmi?
"Çox xəbərdən, - de ki, - yoxdur xəbərim", sən söylə.

Hacı var Kəbəni istər öpə, Şahinsə səni,
De, kimin istəyi üstündü, pərim, sən söylə.

*20.08.2001*

*117-ci gün*

## QƏZƏL

*Bu gün Tamridanın məzar ziyarətinə getdim.*
*Bir an mənə elə gəldi ki, məzar əsir...*

Rəbbəna, qov mehi, bağ içrə sənubər titrər,
Çiçək üstündə tutan yer özünə tər titrər.

Zabitimsən mənim, ey zabitəli dildarım,
Bilmişəm zabiti görcək niyə əsgər titrər.

Xəncərim qında qalıbdır, Qarabağ yad əldə,
Qəhr edə bilməsə düşmənləri xəncər titrər.

Yerin üstündə atırlar o qədər mərmi göyə,
Zərbələrdən yerin altındakı məhvər titrər.

Hərə öz bildiyi işdən yapışarsa - yaxşı,
Zəri misgərdə görüb qeyz ilə zərgər titrər.

Yenə yad sözlərə "şairlər" olublar məftun,
Elə "şairləri" görcək yenə Ənvər* titrər.

Özü hiss etməsə də, hiss edirəm, molla əmi
Minbər üstündə yalan söz desə, minbər titrər.

Ey yatan torpağın altında, məzar üstə gəlib,
Sənə yaş tökməsə göz, yaş - darıxar, tər - titrər.

---

* Şair Ənvər Nəzərli



Qələmim şəninə söz yazmasa çatlar bağrı,
Etməsəm gündə sənin vəsfini dəftər titrər.

Niyə qəbr içrə əsirsən, sənə matdır Şahin,
Dedi "yetdikdə görüş vədəsi dilbər titrər".

*24.08.2001*

*120-ci gün*

## QƏZƏL - TƏZMİN

*"Nəvvabı çəkib dari-qəmə bir büti-tərsa,*
*Sənan kimi avareyi-kuhsar mən oldum".*
**Mir Möhsün Nəvvab (XIX əsr)**

Yağdırdı səma cövrü, cəfakar mən oldum,
Göndərdi fəza zülmü olan zar mən oldum.

Yumdun gözünü, sən əlimizdən gecə getdin,
Əfğan eləyən hər gecə, ey yar, mən oldum.

Tənhalığı bir çoxları inkar eləyibdir,
İndi eləyən təkliyi inkar mən oldum.

Bir dərdim əgər vardısa min dəfə də artdı,
Birdən-birə min dərdə giriftar mən oldum.

Eşq badəsini içdi və dar istədi Mənsur,
Xahiş eləyən indi sizə dar mən oldum.

Kim var ölümü özxoşuna eyləyə dəvət?
Ey Şahin, edən ölməyi israr mən oldum.

*27.08.2001*

*121-ci gün*

## QƏZƏL - TƏZMİN

*"Hər təbibə yetişib dərdimi qıldım izhar,*
*Dedi, biçarə, sənin dərdinə dərman olmaz".*

**Həsən Qara Qarabağî (XIX əsr)**

Bu nə cür qəmdi ki, əncamına imkan olmaz?
Necə müşküldü bu, heç vəch ilə asan olmaz?

Bibəristanə dönüb gün, şəkəristan idi,
Nə üçün bəs bəbirstan şəkəristan olmaz?

Məni tək qoydu nigahım bu fəna dünyadə,
Kimsədə məndəki tək naləvü əfğan olmaz.

İstəsəydim canını qurban edərdi dərhal,
Mənə canənə kim olsa, elə canan olmaz!

Vəslini eyləyirəm arizu hər dəm, Rəbbim,
Mən kimi bəndədən hicran neçin yan olmaz?

Dərdini məndə qoyubsan məni ey dərdə salan,
Öz canım tək sanıram dərdə dözən can olmaz.

Yetmək üçün sənə hər gün əcəli səsləyirəm,
Şahinin, gəlsə əcəl bil ki, peşiman olmaz.

*28.08.2001*



*123-cü gün*

## AZALMA VƏ BÖYÜMƏ

Səni basdırdığım gün
bir şahinin qanadı qırıldı,
bir şairin köksündəki
söz varağı cırıldı,
bir aşiqin ürəyi dağlandı,
bir alimin kitabı bağlandı.
bir tutinin dili sındı,
bir bağbanın beli sındı.
bir ümidvarın ümidi itdi,
bir məhəbbət dastanı bitdi.
bir qəbirqazanın əli qabarladı,
bir mollanın gözü parladı...

Səni basdırdığım gün
dünya həmin dünya,
göy həmin göy idi.
Yer bir adamlıq azaldı,
torpaq bir adamlıq böyüdü.

*30.08.2001*

*126-cı gün*

## QƏZƏL

Niyə tək qalmağımı bildi rəva yar mənim?
Başıma etdi geniş aləmimi dar mənim.

Neyini çalma, sızıldatma daha neyçi baba,
Ürəyim ney kimi hər vədə sızıldar mənim.

Ağlama, hər ikimiz sınmışıq, ey saqi, bu gün,
O sınıq badə sənindir, bu sınıq tar mənim.

Deyirəm öz-özümə "öz-özünün qədrini bil",
Qədrimi bilməyəcəkdir axı qəddar mənim.

O qəzəlxan ki, məni bir belə qəmləndirdi,
Düşəcəkdir günümə bəlkə də naçar mənim.

Əcnəbi söz ki yazırlar, dilimə təhqirdir,
Eləyir halımı, əhvalımı hey zar mənim.

Şahinin söhbəti, əlbəttə ki, şahinlə tutar,
Şahinəm, sərçələr ilən nə işim var mənim?

Mətləbindən nə üçün sən yayınırsan, Şahin,
Niyə tək qalmağımı bildi rəva yar mənim?

*2.09.2001*



*130-cu gün*

## TƏKBEYT

Nə günah eyləmişəm mən ki, bu cür tək qaldım,
Dözümüm bitdi, tabım itdi və kövrək qaldım.

*6.09.2001*

*134-cü gün*

## QƏZƏL

Can evini nagəhan tərk elədi can özü,
Bağdə dərvazəni bağladı bağban özü.

Söylər idi "qoyma tək sən məni, təklik - zülüm!.."
Qoydu məni amma tək indi o canan özü.

Gör necə zalım fələk etdi pərişan məni,
Aşiqinə təzimi eylədi hicran özü.

Çərxi-fələk bir zaman şad eləmişkən məni,
Gör nə sayaq eylədi zarü pərişan özü.

Uyğun edərkən mənim meylimi imkanıma,
Tərk elədi büsbütün qəlbimi imkan özü.

Şövq ilə vəsf etsə də, dövrünü, dövranını,
Şairə cövr eylədi dövr özü, dövran özü.

Yoxdu bilən qədrimi indi mənim, Şahina,
Fəxr eləyər vaxt olar Azəribaycan özü.

*10.09.2001*

## ÖZ ƏLİMƏ GÖTÜRMÜŞƏM ÖZÜMÜ

Eşidirmi Pərvərdigar sədanı?
Özüm zara gətirmişəm özümü.
İtirəndən bəri həmin adamı,
Ay adamlar, itirmişəm özümü.

Hanı ölüm, nigaranam, o qaçır,
Qaranlıqdır, əlimdə şam... o qaçır.
Çatmalıyam, mən qovuram, o qaçır,
Əzrayıla yetirmişəm özümü.

Bir qocayam gəncliyini bitirən,
Bir şahinəm tapdığını itirən.
Gərək deyil məni yerdən götürən,
Öz əlimə götürmüşəm özümü.

*12.09.2001*





## TAPACAĞAM SƏNİ GƏLİB

Ustad bir mühasib kimi,
Hesabımı biləm gərək.
Yazmaq üçün qəmlərimi,
Tüküm sanı qələm gərək.

Saqi, mey olsun hey sənin,
Qüssə mənim, giley sənin,
Olsun cam dolu mey sənin,
Mənə cam dolu qəm gərək.
Yarım, səni ana-ana,
Sönmədəyəm yana-yana...
Sevgilisi olmayana
Kədər gərək, ələm gərək.

Qoca dağın çəni gəlib,
Ağappaq kəfəni gəlib...
Tapacağam səni gəlib,
Tapmaq üçün öləm gərək.

*16.09.2001*

*141-ci gün*

## QƏZƏL

Elə bildim ki, o canənə göründü gözümə,
Nəzərim dəydi gülüstanə, göründü gözümə.

Diləyirdim ki, görüm təkcə onun çöhrəsini,
Yerbəyerdən neçə biganə göründü gözümə.

Bülbülü seyr elədim, xeyli səmimanə idi,
Əndəlib* qeyri səmimanə göründü gözümə.

Bu ətir hansı ətirdir yayılır mən tərəfə,
Yox, yarın zülfü deyil, nanə göründü gözümə.

Təkcə gördüm özümü indi yanan eşq oduna,
Sanmayın bir neçə pərvanə göründü gözümə.

Başımı zillətə saldı, başı batsın fələyin,
Saqisi yoxsa da, meyxanə göründü gözümə.

Yeni əfsanə yox idi, onu Şahin yazdı,
Allah-Allah, yeni əfsanə göründü gözümə.

*17.09.2001*

* Əndəlib - ərəbcə bülbül deməkdir.



*143-cü gün*

## QƏZƏL - TƏZMİN

*"Çeşmimdə xəyali-ərəqi-arizi-canan,*
*Guya düri-şəhvardı ümmanda tapıldı".*
**Hacı Əbülhəsən Raci**

Məcnun, güman etmə ki, hər yanda tapıldı,
Axtar onu, gəz, bəlkə biyabanda tapıldı.

Hər aşiqə aşiq demə, hər arifə arif,
Hər bülbülü zənn etmə gülüstanda tapıldı.

Zənn etmə ki Babək daha yox, bir də görərsən,
Əldə tutuban başını meydanda tapıldı.

Hər dərdə əlac olsa da, haqdır ölüm, haqdır,
Aldanma onun çarəsi loğmanda tapıldı.

Tərk eyləsə də yar məni, cismimə hopdu,
Cismani onu qeyb elədim canda tapıldı.

Xoş vəsli əlimdən verib hicran gəzirəm ki,
Bəlkə o vəsl nəşəsi hicranda tapıldı.

Şahin olacaq qeyb nəzərdən neçə müddət,
Bir gün görəcəklər məzarıstanda tapıldı.

*19.09.2001*

*149-cu gün*

## QƏZƏL

Qar təki, sanma soyuq, ey pəri, oldum-getdim,
O qəbir torpağına müştəri oldum-getdim.

Dil dedi "Vahid olan Allahına şükr eylə",
"Qulhuvəllahu əhəd" əzbəri oldum-getdim.

Mən külək timsalı bir yerdə qərar etməyirəm,
Sən gedəndən bəri bir sərsəri oldum-getdim.

Çoxu fəxr eylədi ki, əsgəridir sultanın,
Mənsə məcnunların əsgəri oldum-getdim.

Bizə Şah İsmayılın tunc əli lazımdı bu gün,
Mən isə xan babamın xəncəri oldum-getdim.

Iki "Divan"ı bitirdim başa, çoxdur yenə söz,
Nə qədər sözşünasın sərvəri oldum-getdim.

Hərə öz dininə beyət eləyir, ey Şahin,
Mənsə eşq ölkəsinin kafəri oldum-getdim.

*25.09.2001*



*154-cü gün*

## QƏZƏL

Canan qəmi ləzzətli olurmuş, başa düşdüm,
Hicran dəmi nəşətli olurmuş, başa düşdüm.

Bir gün nədi, bir ləhzə belə görməsə gözlər,
Yar yarına həsrətli olurmuş, başa düşdüm.

Yaz gəldi, işıqlandı baxışlar necə üzdə,
Yaz sevgisi qüvvətli olurmuş, başa düşdüm.

Dünyamızın əğyarləri şöhrətə möhtac,
Aşiqləri şöhrətli olurmuş, başa düşdüm.

Var sahibi iflasə əgər uğrasa batdı,
Aşiqləri şöhrətli olurmuş, başa düşdüm.

Etmiş babamız Molla Füzuli bütə heyrət,
Büt şairi heyrətli olurmuş, başa düşdüm.

Göz yaşlarımın hər biri mirvariyə nisbət,
Göz yaşları qiymətli olurmuş, başa düşdüm.

Rahətlik idi evdə, əzizim, sən olanda,
Tənha kişi möhnətli olurmuş, başa düşdüm.

Sən torpağın altında, mən üstündə təkəm, tək,
Təklik necə dəhşətli olurmuş, başa düşdüm.

Dilləndi Qəni adlı həkim şerim eşitcək:
Şahin sözü hikmətli olurmuş, başa düşdüm.

*30.09.2001*

*167-ci gün*

## QƏZƏL - TƏZMİN

"Etdin gözümün yaşını ümmanə bərabər,
Ol lalərüxün işləri var qanə bərabər".*

Zülm oldu mənim canıma cananı itirdim,
Yoxdur daha bir can ola cananə bərabər.

Tərk eylədi, göz yumdu fəna aləmə, getdi,
Onsuz bu həyat aləmi zindanə bərabər.

Dünyayə vida eylədi hicranə tuş oldum,
Mədhuş nə var ki, ola hicranə bərabər?

Vaxt var idi ki, qar təki, pambıq kimi ağdı,
Rəngi günümün indisə qətranə bərabər.

Xoşbəxt sanardım özümü aləm üzündə,
Olsaydı bu can qəbrə düşən canə bərabər.

Günlərlə edir qəbri ziyarət qoca Şahin,
Yox qeyri məkanı məzarıstanə bərabər.

*13.10.2001*

---

* Beyt Nicatinindir.



*183-cü gün*

## SƏKKİZLİK

Belə düşünmürdüm acı hicranı,
Hüzn nə hüzndür, matəm nə matəm...
Mənə yanaşandan bəri hicr anı,
Səni haraylayır dilim dəmadəm.

Ölmüsən, çox şerim ölüm haqdadır,
Qocalıq alıbdır daha üstümü.
Üzüm varağım tək ağarmaqdadır,
Boyum qısaldıqca qələmim kimi.

*29.10.2001*

*184-cü gün*

## UYU, SEVGİLİM, UYU...

Bu gün yaşındır sənin,
keçir təvəllüdündən
59 il bu gün,
həm də yarım il keçir
üstündən ölümünün...

Təvəllüd - 59,
vəfatınsa - yarım il...
gülsünmü, ağlasınmı,
de, hansını eləsin
biçarə Şahin Fazil?

Mən
yanında olanda,
hətta olmayanda da
qeyb eləyib yaşını
alardım sənə çiçək,
müyəssər deyil daha
səni təbrik eləmək.

Nə danışım, nə deyim?
müyəssər deyil daha
səsini eşitməyim.

Müyəssər deyil daha
əllərindən tutmağım.
Sevincimi artırıb,
Dərdimi unutmağım.

Qələmim qan ağlayır,
İndi qələm ucu yaş,
indi qələm ucu su.
Ey sonuncu şerimin



birinci oxucusu.
Müyəssər deyil daha
eşidəsən şerimi.
Bildirəsən fikrini
mənə mükafat kimi.

Müyəssər deyil daha
hər səfərə çıxanda,
Başlayasan Allaha
dualar eləməyə,
dalımca atasan su
su tək qayıdım deyə.
Müyəssər deyil daha
Hər səfərdən dönəndə
qabağıma qaçasan,
mənə süfrə açasan.

Müyəssər deyil daha
Şahininlə Şirvana,
Mil-Muğana, Arana,
Türkiyəyə, İrana
gedəsən.
Müyəssər deyil daha
hər kitabım çıxanda
"Ailə fərmanıyla"
məni təltif edəsən...

Təvəllüd - 59,
vəfatınsa - yarım il...
Gülsünmü, ağlasınmı,
de, hansını eləsin
biçarə Şahin Fazil?

Əlimizdən nə gəlir,
Dünya budur, həyat bu.
Mən də uyuyacağam,
Uyu, sevgilim, uyu.

Bu bivəfa fələyin
qəbirqazan əliylə
hələ çox qazılacaq
quyu, sevgilim, uyu.

Qalanlar yaş tökəcək
gözlərindən çay kimi,
bu quyu çox çəkəcək
suyu, sevgilim, uyu.

İnsan yemək - adəti,
Neçə qarış artacaq
yerin qəddi, qaməti,
boyu, sevgilim, uyu...

Ömür sənə amanat,
Ömür mənə amanat,



Ömür bizə amanat,
Bizə Allahımızdan
Amanatdır bu həyat...

İmkanı olan kimi
Şahanəm Şamaxıdan
mənim ilə danışır.
Ülviyyəm ağlasa da
ürəyində hər anda,
mən yanında olanda,
kədərlənməyim deyə,
qəhərlənməyim deyə
gülə-gülə danışır.
Nəvələrim hal tutur,
Dostlarım əhval tutur,
Evdəsə tənhalığım
Gözümə dəsmal tutur...

Uyu, sevgilim, uyu...

Bu gün yaşındır sənin,
Keçir təvəllüdündən
59 il bu gün,
həm də yarım il keçir
üstündən ölümünün...

*30 oktyabr 2001*

## QƏZƏL - TƏZMİN

"Ey könül, aşiq olan can ilə cananı sevər,
Hərgiz aşiq demək olmaz ona ki, canı sevər"*

Var müsəlman ki, kafərlərə meyl eyləmədə,
Varmı kafər ki atıb küfrü müsəlmanı sevər?

Mərdi dəvət eləsə mərdlər əgər meydanə,
Orada olsa da qurban yenə meydanı sevər.

Nə bəla bülbülə gəlmiş ki, çəkilmiş küncə -
Nə meyl gülşənə eylər, nə gülüstanı sevər.

Mən Qavaldaşda qaval çalmalıyam dərdimdən,
Bu səbəbdən də könül mülkü Qobustanı sevər.

Bu qəzəl sahibinin həzzi məzarıstandır,
Varmı nakam onun tək məzarıstanı sevər?

O ki, hicranı sevərdi, itirəndən yarı,
Şahinə söyləmək olmaz daha hicranı sevər.

*3.11.2001*

* Beyt Ağadadaş Münirinindir.





## QƏZƏL - TƏZMİN

"Əgər can görmək istərsən bədənsiz,
Gör ol ruhi-rəvanı pirəhənsiz".*

Onu qeyb etdiyim gündən qəmim var,
Vətəndaşə vətən yoxdur vətənsiz.

Məhəbbət bağımın gülgün gülüydü,
Bağım qaldı qərənfilsiz, süsənsiz.

Nigarıyla sevinərdi, gülərdi,
Sevən qan ağlayır indi sevənsiz.

O mənlə fəxr edərdi, mən onunla,
Mən onsuz qalmışam indi, o mənsiz.

Bağım soldu, dağım uçdu, çölüm yox,
Necə əmr eyləyim bilməm çəmənsiz.

Kəfən lazım deyil torpaqpərəstə,
Məzarçı, Şahini dəfn et kəfənsiz.

*4.11.2001*

* Beyt Əhməd Nilinindir.

*190-cı gün*

## DÖRDLÜK

Mən onu itirdim, taleyimə bax,
Görən çataramımı sabahkı günə?
Sanki neçə illik vaxt sərf olacaq,
Hicran gecəsindən ümid sübhünə.

*5.11.2001*

*191-ci gün*

## QƏZƏL - TƏZMİN

"Ey məh, bəsərim arizi-tabanını istər,
Eyni-nəzəri-nərgisi məstanını istər".*

Loğmanı əlac eyləmədi dərdinə, öldü,
Könlüm o həzin sevgili cananını istər.

İmkan ilə meylim, gözəlim, tərs mütənasib,
Meyl ölməyə çox varsa da, imkanını istər.

Meydanı itirdik uduzub cəngi, bu comərd
Şah İsmayılın cəngini, meydanını istər.

Batmış qanı çox bigünəh övladımın, eyvah,
Qeyrət o şəhid kimsələrin qanını istər.

Xankəndini, Yarəb, o sayaq istəyirəm mən
Bülbül necə şövq ilə gülüstanını istər.

---

* Beyt Məhəmməd Əmaninindir.



Hər canlını sevmək mənə məslək, mənə qayə,
Xudbin elə kəs var ki, fəqət canını istər.

Var öylə adam ki, edə fəth aləmi doymaz,
Şahinsə fəqət Azəribaycanını istər.

*6.11.2001*

*195-ci gün*

## QORXULAR HARA GEDİR?

Göyə baxıb çox illər
"Yahu", "yahu" deyirlər.
Yahular hara gedir?

Dağ - xata, düz - təhlükə,
Yollarda yüz təhlükə,
Yolçular hara gedir?

Düzdə ahu qalmadı,
Azaldı, çoxalmadı,
Ahular hara gedir?

Ceyran yox, qəm vurulsun,
Ov yox, sitəm vurulsun,
Ovçular hara gedir?

Qaralacaq ocaqlar,
Yeri dağıdacaqlar,
Ordular hara gedir?

O odlanır, bu sönür,
Nə qədər arzu sönür,
Arzular hara gedir?

Doğrunu ayaqlayan
Özünü doğru sayan
Oğrular hara gedir?

Hər göz bir su borusu,
Çatışmır şəhərdə su,
Bəs sular hara gedir?
Fəlakət öləcəkmi?
Səadət güləcəkmi?
Sorğular hara gedir?

Məzardasan, ey sənəm,
Mən də ölmək istərəm,
Qorxular hara gedir?

*10.11.2001*



*197-ci gün*

## AMAN, MƏN QALDIM, MƏN QALDIM...

Görünmürəm, çıraq söndü,
Nihan mən qaldım, mən qaldım.
Göy ağladı, ocaq söndü,
Yanan mən qaldım, mən qaldım.

Çoxaldı ələm sürüsü,
Böyüdü sitəm sürüsü,
Sevinmədə qəm sürüsü,
Çoban mən qaldım, mən qaldım.

Şam əridi - pərvanə mən,
Ağlım itdi, divanə - mən.
Məcnun kimi divanədən
Nişan mən qaldım, mən qaldım.

Çox gözəlin nazı sındı,
Bülbülün avazı sındı,
Qorqud öldü, sazı sındı,
Ozan mən qaldım, mən qaldım.

Tapılmadı çara, getdi,
Ağ gün oldu qara, getdi,
Sevgilim məzara getdi,
Aman, mən qaldım, mən qaldım.

*12.11.2001*

*198-ci gün*

## QƏZƏL - TƏZMİN

"Gül, yoxsa o yar, xoş deyildir,
Mey yoxsa, bəhar xoş deyildir".*

Bağban, məni qoy ayağın altda,
Bağ üstdə hasar xoş deyildir.

Sərvimdi mənim o sərvqamət,
Sərv öldü, çinar xoş deyildir.

Var çoxlu nigar başqa-başqa,
Hər başqa nigar xoş deyildir.

Mən qeyri diyarə intizarəm,
Yarsız bu diyar xoş deyildir.

Quranı şüar edən xoş olsun!
Hər hərzə şüar xoş deyildir.

Təklik məni zar edibdi, hətta
Təkdirsə, məzar xoş deyildir.

Yarsız yaşamaq dilərsə Şahin,
Billəh, o qərar xoş deyildir.

*13.11.2001*

* "Gol bi roxe-yar xoş nəbaşəd,
Bi bade bəhar xoş nəbaşəd".
**Hafiz Şirazi**



*199-cu gün*

## QƏZƏL - TƏZMİN

Tar yoxdur deyə mizrab ilə ülfət yoxdur,
Yar yoxdur deyə çoxdandı o işrət yoxdur.

Yarımın ruhini çəkdin göyə sən, ey Tanrım,
Yerdə çünki yaranışdan bəri cənnət yoxdur.

Yuxuda söhbət edərdim həmişə, gözlərimə
Yuxu gəlmir deyə dildar ilə söhbət yoxdur.

O məhəbbət deyilən dürr dolu dərya tərəfə
Məndə addımlamağa bir gilə taqət yoxdur.

"Dər xərabate-moğan nure-xoda mibinəm",*
Bizdə Hafiz görəni görməyə qüdrət yoxdur.

Hafizanə kədərin şəklini çəkmək dilədim,
Amma gördüm qələmimdə elə qüvvət yoxdur.

"Diləsəm himməti meyxanəçidən, eyləmə eyb,
Şeyximiz söylədi ki, hücrədə himmət yoxdur".**

Kimə lazım bu qəzəllər ki, yazırsan xəlqi,
Şahina, zərrə qədər heç sənə diqqət yoxdur.

*14.11.2001*

* "Tanrının nurunu meyxanədə mən görmədəyəm".
**Misra Hafiz Şirazinindir.**

**"Gər mədəd xastəm əz pire-moğan, eyb məkon,
Şexe-ma goft ke, dər sovmee hemmət nəbovəd".
**Beyt Hafiz Şirazinindir.**

*200-cü gün*

## YARIM İL VƏ YARIM AY, YAXUD ÖLSƏYDİM YAŞAYARDIM

Qalmayıb hövsələ məndə,
qalmayıb səbir də...
Surətin gözümün önündə,
cismin qəbirdə.

Mənə turacdın,
sənə şahindim,
mənə yardın,
sənə yardım,
"Insan öləndən sonra da yaşayır" deyirlər,
etməyirsən mənə yardım,
yanına aparmırsan məni,
yaşatmırsan mən qocanı,
mən xəstəni,
ölsəydim yaşayardım.

Altı ay yarımdır darıxıram,
Səni yarım gün görməyəndə
darıxardım.



Tək qoydu,
tənha qoydu,
yalqız qoydu
sevən sevəni.
Daha yarı canım qalmayıb,
Yarım il
və yarım aydır
görmürəm səni.

*15.11.2001*

*201-ci gün*

## DÖRDLÜK

Niyə vəslin məni sövq eylədi hicranə tərəf,
Nəyə lazım mənə can, yoxdu meyl canə tərəf.
Hey baxardım neçə meyxanə sarı, indi isə
Baxıram qibtə ilə mən məzarıstanə tərəf.

*16.11.2001*

202-ci gün

## TƏKBEYT

*Ehtiyatsızlıq balasına mübtəla oldu, xəstələndi...*
*Ölməməliydi!..*

Sözə baxsaydın əgər mənlə uçardın göydə,
Yerdəsən, təlimimə az qulaq asdın, neynim...

*17.11.2001*

203-cü gün

## QƏZƏL

Elə zənn eyləmə ki, məndə ümid var olmaz,
Ümidi olmayan, ey dost, ümidvar olma.

Var ümidim ki, görüm dilbərimi cənnətdə,
Yoxsa bir kimsə mənə Yerdə vəfadar olmaz.

Başıma öylə düşüb daş, başa gəlmir şərhi,
Belə xiffət, belə möhnət, belə azar olmaz.

Çünki məhzun ürəyimdə o qədər qəm var ki,
Bir də bir kimsə bu qəmgin kəsə qəmxar olmaz.



Qoy deyinsin yenə əğyar ki, yoxdur əqli,
"- Biəql bir kişi var eşqə giriftar olmaz".

Çoxuna indi cavab verməyə halım yoxdur,
Sanıram indi bir adəm bu sayaq zar olmaz.

Yarsız qaldığı gün öylə kilidləndi dili,
Daha Şahin kimi dilbilməzə dildar olmaz.

*18.11.2001*

206-cı gün

## SƏKKİZLİK

Yaddaşım yaman
zəifləsə də,
Unudarammı
o yarı bəyəm?

Məkanım olur
Əyan get-gedə:
Cənnətdə idim,
Cəhənnəmdəyəm.

*21.11.2001*

209-cu gün

## QƏZƏL

Vida etdi bu dünyayə, mənim yarım çıxıb getdi,
Vəfasız bəndə mən çıxdım, vəfadarım çıxıb getdi.

Həyatın hər dəmindən həzz alan aşiq idim, Rəbbim,
Nə bədbəxtəm ki, qəm gəldikdə qəmxarım çıxıb getdi.

Mənə qürbət diyar içrə hayan oldu uzun müddət,
Cəfa çəkmişdi uğrumda, mədədkarım çıxıb getdi.

Həmi Şahanə, həm Ülviyyədən çox razıyam, amma
Xarab olmaqdadı mülküm ki, memarım çıxıb getdi.

Sanırdım ki, tükənməz varidatım var, varım vardır,
Mənim dürrüm, mənim ləlim, mənim varım çıxıb getdi.

Əlimdən tutmayın bir də, başımdan bağlayın kəndir,
Çəkin, dəysin başım darə ki, sərdarım çıxıb getdi.

Gəl, ey bülbül, mənim əhvalimə qan ağla, Şahindim,
Səsim batdı, gülüm soldu, çəmənzarım çıxıb getdi.

*24.11.2001*



215-ci gün

## MƏZARINI YARACAĞAM

Ürəyimdə dərd cücərdi,
Dərdimi kimə danışım?
Çəkməliyəm mən bu dərdi,
Mizrabımı simə çəkib
Tar çalım, simə danışım.

Sığışmıram yerə, göyə,
Qəbrin yanında var yerim.
Məni tək qalıbsan deyə
Sənə sarı dartar yerim.

Nə ölüyəm, nə də sağam...
Məzarıma girən kimi
Məzarını yaracağam.
Dəfnim günü bu sirrimi
Gərək qəbrimə danışım.

*30.11.2001*

*218-ci gün*

## QƏZƏL

Saqi, təklif eləmə yar mənə, yar odur,
Qeyri dildar nə lazımdı ki, dildar odur!

Çox səbəbkar səbəbdirsə pərişanlığıma,
Məni bədbin eləyən ümdə səbəbkar odur.

O da ki yoxdu bu dünyadə həmi, həm vardır,
Həmi "yox" söylədiyim, həm dediyim "var" odur.

Yaşayır qəlbim içində, mənə şəkk eyləməyin,
Ölümüylə ölümü eyləyən inkar odur.
Eşqini eyləməsin qoy mənə heç kim izhar,
Eşqini gündə edən indi də izhar odur.

Çox kəsi imtahan etdikdə vəfasız gördüm,
Mən vəfadarə vəfa rəmzi vəfadar odur.

Şahinə təklif edirsənsə əgər mey, ləbbeyk,
Saqi, təklif eləmə yar mənə, yar odur!

*3.12.2001*



*219-cu gün*

## QƏZƏL-TƏZMİN

*"Zahid, ol guşeyi-əbrudəki bir xal mənim,*
*Künci-mehrab sənin, səbheyi-səddanə sənün"*
**Hacı Əbülhəsən Raci**

Gəlmədi azca da rəhmin bu həzin canə sənin,
Olmadı mərhəmətin heç bu pərişanə sənin.

Var idi çox dözümü, indi isə yoxluğuna
Aşiqin tab eləmir, olsa da mərdanə, sənin.

Gözünün şöləsini görməyirəm məşəldə,
Zülfünün ətrini vermir, gözəlim, nanə sənin.

Neynirəm dürr ilə dürdanə dəxi, ey dünya,
Kaş olaydı o mənim, dürr ilə dürdanə sənin.

Yarımın qəbri tərəfdən mənə bir səs gəldi:
"Bilir Ülviyyə, bilir qədrini Şahanə sənin".

Söylədim son tərəfə "razıyam onlardan çox,
Aşiqin amma ki olmaz daha məstanə sənin.

Unudubdur namazı, kafər olubdur Şahin,
Beləcə dəydi ziyanın bu müsəlmanə sənin.

*4.12.2001*

## SƏNİN SEVGİN

Sənin sevgin
bəşəri sevgilər müqabilində
balaca, bapbalaca,
lap balaca bir quşdu,
sinəmi
dimdiyiylə yarıb
ürəyimə qonmuşdu...
Bir gün
sinəmi
dimdiyiylə yarıb
oradan uçdu,
nəsə,
getdi gedər-gəlməzə...
Sonra
Başqa sevgi quşu
qonmaq istədi ürəyimə,
oynamaq istədi sevgi oyunu,
Amma,
qonsa da üstünə
ürəyim qəbul etmədi onu.
Sonra



təmənnalı başqa quşlar,
başqa cəhdlər...
Amma,
ən xırda bir iynənin
ucu qədər
vermədi səmər,
hər birisinin
cəhdi hədər,
peymanı hədər,
əhdi hədər...

Sənin sevgin
balaca,
bapbalaca,
lap balaca bir quşdu,
sinəmi
dimdiyiylə yarıb
ürəyimə qonmuşdu...

Sənin sevgin...

*5.12.2001*

## YANINA ÖLMƏYƏ GƏLDİM

Başın üstə başdaşı var,
Tozunu silməyə gəldim.
Baş daşında göz yaşı var,
Kimindir bilməyə gəldim.

Söylə, kədər azalarmı?
Qüssə, qəhər azalarmı?
Bölsəm əgər, azalarmı?
Dərdimi bölməyə gəldim.

Sağalmayır sənsiz yaram,
Kəsilibdir daha çaram.
Ölməyə yer tapmayıram,
Yanına ölməyə gəldim.

*6.12.2001*





## QƏZƏL

Həllac dara baxmayacaq darı görürsə,
Kəndir gəzəcək gözləri əğyarı görürsə.

Tərifləmə arif kəsə bu fani cahanı,
Təsdiq ilə yoxdur işi inkarı görürsə.

Qal əhli bıçaq axtaracaqdır bazar içrə,
Hal əhli silah almayacaq tarı görürsə.

Sönməkdədi dərviş olanın iştahı, amma
Yanmaqdadı zərgər gözü mirvari görürsə.

Rəhm əhlinə rəhm eylə ki, rəhmin bada getməz,
Dünya biləcək qədrini qəddarı görürsə.

Görməzsə əgər, aşiqə "kordur" deməsinlər,
Göz görməyəcək heç kimi dildarı görürsə.

Göz yumsa da yarı, yarı görməkdədi Şahin,
Aşiqdə bəsirət gözü var yarı görürsə.

*10.12.2001*

*227-ci gün*

## QƏZƏL

Qəm yastığına baş qoyuban yar ölürdü,
Sağ qalmağıma, ah, səbəbkar ölürdü.

Düşməkdə idi gözləri hər dəmdə ziyadən,
Bitməkdə idi çarəsi, naçar ölürdü.

Tibbin geniş imkanı var ikən yer üzündə,
Dünyanı gözümdə eləyib dar ölürdü.

Hər ləhzə edən sevgimi gün timsalı nurlu,
Hər dəm bəzəyən ömrümü memar ölürdü.

Əhd eyləmiş idik yaşayaq birgə, ölək bir,
Yar əhdimizi eyləyib inkar ölürdü.

Qürbətdə də, ölkəmdə də sirdaş idi sadiq,
Çəkmişdi cəfamı o vəfadar ölürdü.

Eyvah, neçin öldü o, sağ qaldı bu Şahin,
Şahindəki can, ondakı rüxsar ölürdü.

*12.12.2001*



*228-ci gün*

## QƏZƏL

Ölmüşsə də, könlüm yenə dildar yanında,
Yoxdursa da, eyvah, gözüm var yanında.

Şahanə və Ülviyyədə hal qalmamış idi,
Məyus idi mən tək neçə naçar yanında.

Əlbəttə, təbib isə həyatdan danışırdı,
"Zikr etmə ölüm söhbəti bimar yanında".*

Olmuşdu Əcəl Əzrayılın hökmünə tabe,
Lazımdı ki, həmkar ola həmkar yanında.

Qəddar fələk gör necə kam aldı bu kəsdən,
Xar eylədi yar yarını qəddar yanında.

Şahdağda onun büstünü yonmaqdı xəyalım,
Görməz daha Şirinini memar - yanında.

Ölmək diləyi varsa da, Şahin ölə bilmir,
Tökməkdə vəfa yaşı vəfadar yanında.

*13.12.20012*

* Misra Hacı Əbülhəsən Racinindir.

*229-cu gün*

## QƏZƏL

"Əriyib hicrin ilə ta ürəyim qan olmuş,
Yıxılıb cismi-bədən xak ilə yeksan olmuş"*.

Beş nəfər doğma adam qeyb eləmişdim, yarəb,
Niyə mehmanı bu şəxsin yenə hicran olmuş?

Yarımın yoxluğu yandırdı məni məşəl tək,
Hər günüm indi mənim ah ilə əfğan olmuş.

Ömrümü şövq ilə tənzim eləmişdi canan,
Can evim, ah, necə abad idi, viran olmuş.

Mənzilimdə, neçə aydır ki, əsər yox həzzədən,
Kədərü qüssə ilə qəm mənə mehman olmuş.

Mən düşündükcə belə gəldi qeybdən bir səs:
"Azmı aşiq bu cahan içrə pərişan olmuş?

Asilik eyləməyib dözməlisən, ey Şahin,
Döz ki, Allahdən əlbət belə fərman olmuş".

*14.12.2001*

---

* Beyt Faiz Göyçayi Qantemirindir (1888-1938)



*230-cu gün*

## QƏZƏL

Fələyin zərbələrindən ürəyim yarə olub,
Nə əlacım yetişibdir, nə də bir çarə olub.

Yox idi zərrə şikayət bütöv ikən qəlbim,
Sınıq ayinə kimi indisə yüz parə olub.

Mən zəif zənn eləyirdimsə, canım möhkəmmiş,
Olmayıbdır mənə heç nə, nə olub yarə olub.

Tərk edib mənzilimi qəbr evinə yollandı,
Dərdimə çarə edən kəs özü biçarə olub.

Yarının eşqinə yanmışdı Kərəm, indi isə
O giriftarə olanlar bu giriftarə olub.

Mənə ağ köynəyi təklif eləmə, ey satıcı,
Şahinin köynəyi ovqatı kimi qarə olub.

*15.12.2001*

## QARA BAYRAM!

Bayramda da rəng olarmış,
Bayramın da rəngi varmış,
Qara bayram!..

Bu bayramın rəngi qaradır,
Bu bayramın ahəngi qaradır...
Mən bilən
Bayramların hansınasa
Ağ bayram deyən yoxdur,
Çünki
hər bayramın özünün
ağ rəng çaları var,
sarı rəng çaları var,
yaşıl rəng çaları var,
hətta qırmızı rəng çaları var,
sanki göylərdə
yerlər üçün bayram fikirləşənlərin
fırçaları var.
Amma insanlar
Bayramların nə rəngdə olmasını deməzlər,
Bayramları rəngləməzlər



və
bayramı bayram kimi bayram edər hamı,
Bircə bayramı rəngləyərlər:
Qara bayramı!..

Qara bayram!..
Qara bayramdır bu gün...
Dünən Ülviyyəgildə idim,
Sarı halva bişirirdi
bugünkü qara bayram üçün.
Ey bu cahanda
yaşamağın daşını atan,
Ey qara torpaqda yatan,
Sən bilən
o dünyada da bayram varmı?
O dünyada da
bayramlarda
matəm,
həzz,
qəm,
ehtişam varmı?
O dünyada da
bayramların rəngi varmı?
O dünyada da
bayramların

ağ, sarı, yaşıl, qırmızı ahəngi varmı?
Ruhlar hansı bayramasa
Qara bayram deyirmi?
Ruhlar bayram eləyirmi?
Bu bayram,
bu qara bayram
mənim üçün də yaradır,
sənin üçün də.
Bu bayram,
bu qara bayram
mənim üçün də qaradır,
sənin üçün də.
Bu gün mən
ilk şerimi yazdım
bu qara bayram haqda.
Çünki mən
qara gündəyəm,
sən
qara torpaqda.

*16.12.2001*



*234-cü gün*

## QƏZƏL-TƏZMİN

"Kitabi-eşqi mən müjgan ilən yazdım, yazan yazsın,
Mürəkkəbsiz, qələmsiz, can ilən yazdım, yazan yazsın".*

Deyil mümkün bu dünyadə vüsalə yetməyin, aşiq,
Sənin dərmanını loğman ilən yazdım, yazan yazsın.

Yazarkən sən vüsal haqda kənarə qovma hicranı,
Vüsalı dəmbədəm hicran ilən yazdım, yazan yazsın.

Hər adəm ki, öləndən sonra ölməzdir, ölümsüzdür,
Bu misranı, bilin, irfan ilən yazdım, yazan yazsın.

Vətəndaşın vətən dərdi fəqət söhbətlə həll olmaz,
Bu dərdin həllini üsyan ilən yazdım, yazan yazsın.

Dəyərsiz quldan əskikdir gözümdə müti hər bəndə,
Qulun fərmanını sultan ilən yazdım, yazan yazsın.

Üzülmüş hər gülün fəryadını şair eşitməkdə,
Gülün fəryadını bağban ilən yazdım, yazan yazsın.

Əgərçi fani dünyadən köçüb cananım, ey Şahin,
Bu şeri mən bu gün canan ilən yazdım, yazan yazsın.

*19.12.2001*

---

* Beyt müasir Ərdəbil şairi Şahi adlı müəllifindir.

*236-cı gün*

## QƏZƏL

Yollarımda vardı çox sirdaş hərgah, ah, ah,
Qalmışam tək, indi yoxdur bircə həmrah, ah, ah.

Gündə bir yol ah edirsə qeyri aşiqlər əgər,
Köksüm içrə qopmada hər ləhzə min ah, ah, ah.

Eşq mülkündə nizam eylər sevənlər arizu,
Eşq mülkün etmədi Allah islah, ah, ah.

Qarə gəldi ruzigarım, neyləyim, tək qalmışam,
Qarə torpaqda yatıbdır yarım, eyvah, ah, ah.

Mən ki Allahsız deyildim, bəs neçin gördüm bəla?
Mən ki hər dəm söyləmişdim "Qulhüvəllah", ah, ah.

Bixəbərdir dağ şahı Şahdağ dağımdən mənim,
Bu nə dərddir üstümə göndərdi Allah, ah, ah.

Tuti oldum yarımı qeyb etdiyim gündən bəri,
Gah "vaveyla" deyir dil, Şahina, gah "ah, ah".

*21.12.2001*



*238-ci gün*

## DÖRDLÜK

Axmayır, dayanıb daha göz yaşın,
Yoxsa ki o dünya xoşuna gəldi?
Yerüstü cəncaldan qurtardı başın,
Yeraltı hadisə başına gəldi.

*23.12.2001*

*242-ci gün*

## QƏZƏL-TƏZMİN

Axşam olcaq öylə ki, aləm çırağın yandırır,
Şahin isə qəlbinin ol dəmdə yağın yandırır.

"Eşq əhli aşiq istər cümleyi-əhbabını,
Kim, səməndər mizban olsa qonağın yandırır".*

Yad kəlamı hansı şair yan edirsə şerdən,
Sanki bağbandır girib bağə alağın yandırır.

Ay oyaq, ulduz oyaqdır, mən oyaq, dərdim oyaq,
Yatmamaqçın azca həm dərdim yatağın yandırır.

Ol diyarı zənn edirdik... Car çəkirdik aləmə:
Kim bu torpağə ayaq bassa ayağın yandırır.

Qarə bağda qırmızı məşəllərim sönmüş bugün,
İndi düşmən torpağımda öz ocağın yandırır.

Bizdə qeyrət rəmzidirsə gər papaq, kibrit verin,
Ey papaqlı kimsələr, Şahin papağın yandırır.

*27.12.2001*

* Beyt Əlican Qövsi Təbrizinindir.

## QƏZƏL

*Müasir Ərdəbil şairi Ələsgər Sadiqin bir qəzəlinə təzmin*

Meyxanələri bağladı məstanə də, mən də,
Xiffət çəkibən ağladı biganə də, mən də.

Hərdən saralardı oluban dərdə giriftar,
Həsrətlə saralmış yenə gülxanə də, mən də.

Olsaydı müyəssər odu mən ləğv eləyərdim,
Şəmin oduna yanmada pərvanə də, mən də.

Əğyarləri daima meydanə çağırdıq,
Qeyz ilə vuruşduq neçə mərdanə də, mən də.

Dörd can, elə vaxt var idi, bir can kimi idi -
Tamrida da, Ülviyyə də, Şahanə də, mən də.

Şahin, elə zülm etdi fələk, bir-birimizdən
Düşdük əbədi ayrı o cananə də, mən də.

*29.12.2001*





## QƏZƏL

Həzzim təzədən əzab içində,
Cismim yeni inqilab içində.
Meyxanəyə meydən ötrü getməm,
Mən şər görürəm şərab içində.

Saqi, mənə bir qədəh gülab ver
Var isə zəhər gülab içində.

Ey yar, məzar içində cismin,
Qoydun məni iztirab içində.

Var idi fərəh kitabı canda,
Var indi kədər kitab içində.

Yarəb, niyə eylədin məni zar,
Taqət daha yoxdu tab içində.

Bal axtarıram ki, zəqqum olsun,
Ağu gəzirəm doşab içində.

Qıydın nə üçün mənə bu zülmü,
Verdin mənə cövrü qab içində.

Şahin o qədər savab edib ki,
İtmiş günəhi savab içində.

*30.12.2001*

*246-cı gün*

## QƏZƏL

Şahina, ağla ki, fəryadə tərəf getməlisən,
Doğmanı qeyb elədin, yadə tərəf getməlisən.

Ruhdən düşmə, könül, yox, bu işə cəhd eləmə,
Eşqinə sən hələ imdadə tərəf getməlisən.

Doğmalıq gözləmə heç vədə yad insanlardan,
Yoluna göz dikən övladə tərəf getməlisən.

Yar mümkünmü ki yaddan çıxa bir yad kimi?
Məsləhətçin neçə ustadə tərəf getməlisən.

Səkkiz aydır ki, onun cismini torpaq aldı,
Qəbrə girmiş o pərizadə tərəf getməlisən.

Sən ki, eşq əhlisən, əğyar deyilsən, Şahin,
Kərəmə, Məcnuna, Fərhadə tərəf getməlisən!

*31.12.2001*



*248-ci gün*

## QƏZƏL

*Tərcümeyi-halım*

Saf yaratmaq qəzəli şövq ilə qismətdi mənə,
Nə ki qismətdi mənə, həm də şücaətdi mənə.

"Mərhəba" söylədi yarım eşidib sözlərimi,
Yarımın söylədiyi kəlmə kifayətdi mənə.

Mən göz açdım bu cahan mülkünə qoç bürcündə,
Döyüşüb ömr eləmək qoç kimi adətdi mənə.

Gəlmişəm xeyli il əvvəl Qubadan mən Bakıya,
Bu gəliş, zənn edirəm böylə ki, hicrətdi mənə.

Əfqanıstanə səfərlər elədim illərlə,
Gəncliyim qaldı o torpaqda ki, cənnətdi mənə.

Sonra İran ilə Türkiyyə, İraq oldu nəsib,
Şuralar səltənəti seyrü səyahətdi mənə.

Elmə verdim gözümün nurini illər boyu mən,
Bu şərəfdi mənə, əlbəttə, şərafətdi mənə.

Könlümün bülbülü bir gül tərəfə boylandı,
İki gül verdi o bir gül ki, fəxarətdi mənə.

Səkkiz aydır ki, gedibdir o bəqa aləminə,
İndi onsuz yaşamaq cövrü əziyyətdi mənə.

Qocalıq cummadadır qırğı kimi sürətlə,
Uçmamaq göylərə şahin kimi zillətdi mənə.

Iki "Divan"ı bitirdim, budu sərvət, budu var,
Var-yoxumdan elə miras belə sərvətdi mənə.

Eşq qəsrindəki üst mərtəbə Məcnunə çatıb,
Şahinəm, neyləyim, alt mərtəbə qismətdi mənə.

*2.01.2002*





## QƏZƏL

Bağban niyə zülm etdi çiçək getdi əlimdən,
Zər qaldı əlimdə kəpənək getdi əlimdən.

Bir dəstə təbib açmadı baş xəstəliyindən,
Bir sirr kimi, möcüzə tək getdi əlimdən.

Ölməkdən əlavə bu kəsin arzusu yoxdur,
Yarəb, nə qədər arzu-dilək getdi əlimdən.

Hər ləhzə pənah idi mənə, tunc biləyimdi,
Əl heyrətə düşmüş ki, bilək getdi əlimdən.

Tabım tükənib, taqətimin ömrü gödəkdir,
Yoxdur köməyim indi, kömək getdi əlimdən.

Yumşaq idi rəftarı ipək timsalı, eyvah,
Codlaşdı həyatım ki, ipək getdi əlimdən.

Yox məndə ürək, əmr edirəm indi ürəksiz,
Şahin necə ölmür ki, ürək getdi əlimdən.

*5.01.2002*

*254-cü gün*

## QƏZƏL

Yoxsan deyə güldən və çiçəkdən aralandım,
Heç kim bunu etməzdisə də, mən aralandım.

Bir şairi gördüm dedi "şeytan da mələkdir",*
Şeytan da mələkdirsə mələkdən aralandım.

Yarəb, nə qədər arzu mənim qaldı gözümdə,
Tanrım, nə qədər ülvi diləkdən aralandım.

Aşiqlik edirdim hələ mən körpəliyimdən,
Hətta o zamandan ki, bələkdən aralandım.

Dağlarda küləklərlə daha oynamıram mən,
Bağlarda gözüm yox, çiyələkdən aralandım.

Məscidi atıb bilməyərəkdən uzaq oldum,
Meyxanədən amma bilərəkdən aralandım.

Düz gəlmədi şeytan əməli işləri ilə,
Saqimsə kələk gəldi, kələkdən aralandım.

* Şair Samir Sədaqətoğlu



Əfsus, cavan ömrə xəzan yağmuru yağdı,
Gənclik deyilən ömrə bəzəkdən aralandım.

Keçmiş məni üzdü, gələcək qorxuya saldı,
Keçmişdən üzüldüm, gələcəkdən aralandım.

Bığlı kişi var çoxlu çadırda... Görərəmmi
Minlərlə "çadır" adlı ləçəkdən aralandım?

Şahin, əriyibdir ürəyim, haldı qəribə,
Sağəm nə sayaq mən ki ürəkdən aralandım?

*8.01.2002*

*260-cı gün*

## DÖRDLÜK

Bu fəna dünyadan elə ki doydun,
Bəqa aləminə çıxıb gedəndə
Sən mənə yadigar eşqini qoydun,
Ondan da dəyərli yox heç nə məndə.

*13.01.2002*

*261-ci gün*

## YOXDUR GÖZLƏYƏN MƏNİ

Budur, mən qayıtmışam,
Səfərdən qayıtmışam...
Tənhalığı qaldırıb
Təkliyi oyatmışam,
Susub səsləyən məni,
Yoxdur gözləyən məni.

Göyümdən sitəm damır,
Yağış deyil, qəm damır.
Ayımın ziyası yox,
Günəşim parıldamır.
Sarıb duman, çən məni,
Yoxdur gözləyən məni.

Sevda dolu cam hanı,
Sevdaya inam hanı?
Tapıb divanəliyi
İtirmişəm Leylanı.
Tutun Qeysə tən məni,
Yoxdur gözləyən məni.

Evdə - can çıxanacan,
Nagəhan çıxanacan,



Bir gün Əzrayıl gəlib
Cismimi yıxanacan
Görməliyəm mən məni,
Yoxdur gözləyən məni.

Həyat məni təklədi,
Canda qəm çiçəklədi.
Qəbrinə cocuq təki
Bu qoca iməklədi.
Tərk elədin sən məni,
Yoxdur gözləyən məni.

*14.01.2002*

*262-ci gün*

## ALLAH SƏBİRLİDİ, DÜNYAMI YOXSA?

Xilqət ayaqlara atdı şərəfi,
Adəm səbirlidi, Həvvamı yoxsa?
Təsəvvüf irfanın başqa tərəfi,
Surət səbirlidi, mənamı yoxsa?

Nədənsə fərəhi məlal istəmir,
Nəsə gerçəkliyi xəyal istəmir.
Bəlli ki, heç biri vüsal istəmir,
Məcnun səbirlidi, Leylamı yoxsa?

Susubdur, eləmir səs-səda yarım...
Həyatıma şərik olsa da yarım.
Məni tənha qoydu dünyada yarım,
Allah səbirlidi, dünyamı yoxsa?

*15.01.2002*

***266-cı gün***

## QƏZƏL

Necə möhnətli çağım var mənim,
Hər gecə ağlamağım var mənim.

Yoxluğun gəldi qonaq mənzilimə,
Yoxluq adlı qonağım var mənim.

Kəc fələk üstümə dərd göndərdi,
Dərdlə nərd oynamağım var mənim.

Sarılıb boynuma qəm, qüssə, kədər,
Necə gör təmtərağım var mənim.

Qum kiçiklikdə sevincim yoxdur,
Dağ böyüklükdə dağım var mənim.

Tüstünün məndən ağırdır çəkisi,
Odu sönmüş ocağım var mənim.



Sərv idim, sərvərim idi, qurudum,
Suyu itmiş bulağım var mənim.

Neçə vaxtdır səsini dinləmirəm,
Səsə möhtac qulağım var mənim.

Ey təbiblər, əlil olmuş adamam,
Çolaq olmuş ayağım var mənim.

O yaxınlıq uzaq olmuş məndən,
Yaxınım yox, uzağım var mənim.

Kuzə sınmış, mey axıb getmişdir,
Meyə həsrət dodağım var mənim.

Mənzilimdən neçə aydır ki, qaçıb,
Ey hökümət, qaçağım var mənim.

Çox güman nurla dolubdur qəbri,
Zülmət içrə çırağım var mənim.

Şahinəm, ağlayıram, hərçənd ki,
Ləçəyim yox, papağım var mənim.

*19.01.2002*

*270-cı gün*

**DÖRDLÜK**

Sevgi baş qayədir, eşq baş məram,
Mehrin ürəyimdə yaşayacaqdır.
Mən səndən heç zaman uzaqlaşmaram,
Əzizim, uzaqlıq səndən uzaqdır.

*23.01.2002*

*274-cü gün*

**CANIM, NƏ BÖYÜKMÜŞ ƏLƏYİN GÖZÜ**

Qaraldır gözümü mənim get-gedə,
Tənənin, eyhamın, gileyin gözü.
Ürək danışmada, dilək görmədə,
Ürəyin sözü var, diləyin gözü.

Bütöv məmləkətim dağım-dağımda,
Düşmən at oynadır Qarabağımda.
Başıma qar yağdı cavan çağımda,
Qaranı ağartdı fələyin gözü.



Rahatlıq günbəgün məndən yan düşür,
Həsrətdən araya qada-qan düşür.
Bu nə damcıdır ki, ağacdan düşür,
Deyəsən ağlayır çiçəyin gözü.

Yoxsa da ayağı, götürüb qaçır,
Əlimdən varağı götürüb qaçır,
Başımdan papağı götürüb qaçır,
Qaralayıb məni küləyin gözü.

Əzmlə göylərə merac eləmək,
Rəbbə yaxın olmaq diləyir ürək.
Gözə görünmürsə gözü yox demək,
Görən necə görür mələyin gözü?

Zərgər idim, zərim əlimdən gedib,
Sultanım, sərvərim əlimdən gedib.
Qaragöz dilbərim əlimdən gedib,
Daim qan ağlayır ürəyin gözü.

Şahin baxışımı tutub nəm indi,
Köynəyim özümün, yaxam qəmindi,
Ələyin gözündən keçirəm indi,
Canım, nə böyükmüş ələyin gözü.

*27.01.2002*

*277-ci gün*

## BAŞIMA DAŞ DÜŞÜBDÜR

Yarı itirmişəm mən,
Özüm qalmışam deyə
qəlbə təlaş düşübdür.
Keçərək ürəyimdən
gözümə yaş düşübdür.

Gözü görməyib məni,
yarımı aparanda.
Demişəm ki, varam da,
Əzrayılla aramda
dava-dalaş düşübdür.

"Göydən üç alma düşdü...",
Gerçəkdən uzaq baba
nağıl danışma mənə.
göydən alma düşməyib,
başıma daş düşübdür.

*30.01.2002*



*278-ci gün*

## CÜMƏ AXŞAMI

Cümə axşamı günüdür bu gün,
Yəni
bu günün axşamından sonra
gələcək cümə səhəri
və başlayacaq cümə günü -
beşinci gün...
Cümə axşamı gününə isə
"Dördüncü gün" deyirik,
Niyə? Nə üçün?
Qəribədir günlərimizin adı,
Neçin bir həftənin günlərinə
iki ad qoyuldu,
bir ad qoyulmadı?

Cümə axşamı günüdür bu gün,
yana-yana
darıxdıq səninçin
qızın Ülviyyə,
baldızın Nazilə
və mən,

Ziyarətinçin
gəldik məzarıstana,
sənin qəbrin üstünə

Bir qəbirqazan qəbir qazırdı,
hardasa
bir ölü
basdırılmağa hazırdı
bu cümə axşamı günü...

Sahmana salırdı bir usta
qonşu qəbrin üstünü...

Başqa bir qəbrinsə
baş daşı
yaşdı,
Görünür kimsə
ağlamışdı
neçə-neçə göz yaşı töküb...

Sənin qəbrininsə torpağı
baş daşı tərəfdən
çöküb.
İki yüz yetmiş səkkiz gün keçir,



Gün keçir, çətin keçir,
Sən - ölü,
mən - sağ...
Bu yaxınlarda ilin olacaq.
İlinədək gərək
qəbrinin üstünü götürək,
ağ mərmərdən baş daşı qoyaq sənə,
qara mərməri xoşlamıram,
qara mərmər xoş gəlmir mənə,
qara mərmər
aparır fikrimi
qaranlıqlara.
Torpaq qara,
mərmər qara,
bəxt qara.
Onsuz da
günlərin bir günü
mən də sənin kimi
qaranlıqda qalacağam,
amma
hələ sağam,
hələ görmək istəmirəm qara rəngi,
Ağ rəng - rənglərin qəşəngi.
Ağ mərmərdən olacaq baş daşın,

Sonra
səni tənha qoymayacaq
və sənin yanına gələcək
bu tənha sirdaşın.

Ömrümün sonunadək
deyəsən
tənhalıq yazılıb adıma.
Nədənsə,
məndən əvvəl tənha qalan
Nəriman Həsənzadə,
Nəbi Xəzri,
Cabir Novruz
düşdü yadıma...

Cümə axşamı günüdür bu gün...

*31.01.2002*



*280-ci gün*

## QƏZƏL-TƏZMİN

*"Bir qüdrəti-külliyyə var ülvi və münəzzəh,*
*Qüdsi və müəlla, ona vicdanla inandım".*
**Tofiq Fikrət**

Dünya doludur ah ilə əfğanla, inandım,
Gördüm boyanıb dan üzü al qanla, inandım.

Aləmdəki haqsızlığa üsyan elədim mən,
İnsanların üsyanına üsyanla inandım.

Yarım gözünü yumdu gözüm qan ilə doldu,
Qansızlığına mən fələyin qanla inandım.

Cansızdı cism, məndəki həm can üzülürdü,
Cansızlığına sevgilimin canla inandım.

Güllər və çiçəklər də fəqət bir neçə günlük,
Bağ ömrü də fani, buna bağbanla inandım.

Yoxmuş əbədi heç nə bu dünyadə, İlahi,
Tövrat ilə, İncil ilə, Quranla inandım.

Əfsus, sanırdım ki, vüsalın ipi möhkəm,
Şahin, qırılır vəsl ipi hicranla, inandım.

*2.02.2002*

## QƏZƏL-TƏZMİN

"Verər min canı olsa aşiqin canan olan yerdə,
Nədir bir damcı su dəryayi-bipayan olan yerdə".*

Canım çıxsın ki cananım bu gün yoxdur bu dünyadə,
Verərdim canana mən həm canı imkan olan yerdə.

Fərağın rəngi ağ olmur, gözüm qanlı, Araz qanlı,
Bu dərya saf olarmı heç o dərya qan olan yerdə?

Üzüm gülmür, fərəh sürgün düşüb biçarə könlümdən,
Fərəhdə ixtiyar olmaz imiş əfğan olan yerdə.

Müsibət qəsri inşa eylədim qəlbimdə bənna tək,
Səadət qəsri tikməzlər məzarıstan olan yerdə.

Canımdan arzular cari olur hər dəm mənim, amma
Vüsalın həddi vardırmı gələ hicran olan yerdə?

Əzəl sultanımız Allahdır, səbr eylə, ey Şahin,
Olurmu bəndənin həddi məgər sultan olan yerdə?

*5.02.2002*

* Beyt müasir Cənubi Azərbaycan şairi Cəlal Məhəmmədinindir





## ÖMRÜMÜN ƏN AĞIR GECƏSİ

Xoşbəxt idim necə, bədbəxtəm necə!..
Ruhun yer üzündən köçəsi oldu.
Məni tərk eləyib getdiyin gecə,
Ömrümün ən ağır gecəsi oldu.

Ürəkdən çıxan dərd dolub gözümə,
Daha iztirabın dili lal deyil.
Daha gülümsəmir səma üzümə,
Daha şəfəqin də rəngi al deyil.

Döndük qurbanına son gerçəkliyin,
Ey məni həyatda yalqız qoyan kəs.
Mənim tənhalığım, sənin təkliyin,
Daha vüsal ilə olmadı əvəz.

İkiqat elədi məni bu dərdim,
Qəddimi şax tuta bilmirəm daha.
Gözümü həmişə göyə dikərdim,
İndisə dikirəm qara torpağa.

Dözüm də yox oldu, güc də məndəki,
Dərdimi kimsəyə aça bilmirəm.
Daha mən əzəlki Şahinin təki,
Uğur göylərində uça bilmirəm.

Məni tənha qoydun sonuncu kərə,
Dağ çəkdin sinəmə, göynədi dağın.
Ruhun uçub getdi mavi göylərə,
Cisminsə qoynuna girdi torpağın.

Xoşbəxt idim necə, bədbəxtəm necə!..
Ruhun yer üzündən köçəsi oldu.
Məni tərk eləyib getdiyin gecə
Ömrümün ən ağır gecəsi oldu.

*7.02.2002*



*287-ci gün*

## QƏZƏL

Əvvəl mənə tale yar verdi,
Sonra isə intizar verdi.

Əvvəlcə fərəh yetirdi qəlbə,
Gizlətmədi, aşikar verdi.

Sonra fərəhi alıb əlimdən
Dərd verdi mənə, qübar verdi.

Qəhr etdisə - əldən aldı həzzi,
Fəxr etdisə - iftixar verdi.

Üzgünlüyümü apardı badə,
Saqi canıma xumar verdi.

Dünya mənə sonda zülm edib də,
Tək qalmağıma qərar verdi.

Mən torpağa bir nigar verdim,
Torpaq isə bir məzar verdi.

Varlıq bağını itirdi Şahin,
Yoxluq bağı isə bar verdi.

*9.02.2002*

*288-ci gün*

## QƏZƏL

Dava həvəsin varsa xəncər də kifayətdir,
Yoxdursa əgər xəncər qənbər də kifayətdir.

Başlarsa vətənpərvər cəng etməyə əzm ilə,
Hal olmasa zabitdə əsgər də kifayətdir.

Hər kəs bilə bilmirsə Quran dilini əzbər,
"Bismillah" ilə "Allah-əkbər" də kifayətdir.

İndi qəzəlistanda söz zərgəri yoxdursa,
Gər Ənvəri* yoxdursa, Ənvər** də kifayətdir.

Yar öldü... Gözüm içrə Tərtər qədəri yaş var,
Ümman ola bilməzsə, Tərtər də kifayətdir.

Yonmaq dilədim yarə bir büst qızıldan mən,
Göydən belə əmr oldu: Mərmər də kifayətdir.

Hicrandə o dildarın "Divan" yazacaq Şahin,
Qoy söyləməsinlər ki, dəftər də kifayətdir.

*10.02.2002*

* Ənvəri - Əsl adı və soyadı Əli Əvhədəddin Əbiverdi olmuş, təqribən 1126-1191-ci illər arasında ömür sürmüşdür. Sultan Səncərin sarayında yaşayan Ənvəri ömrünün sonlarında saraydan uzaqlaşmış, məddah şairlərə həcvlər yazmışdır. Böyük alman şairi I.V.Hötenin yüksək qiymətləndirdiyi yeddi qüdrətli şairdən biridir.
** Ənvər Nəzərli



*290-cı gün*

## QƏZƏL

Şahininin ömrü nə miqdar olar,
Qəlbi o miqdar onun zar olar.

Sinədəki qəm yerə yerləşməyir,
Zənn edirəm göy də ona dar olar.

Tərk eləyib çünki məni getmisən,
Sən kimi kimdir ki, vəfadar olar?

Var elə dərd yoxdur onun çarəsi,
Kim bu həzin tək belə naçar olar?

Ey gözəlim, indi bir olsaq, mənə
Qupquru səhra da çəmənzar olar.

Meyarı eşq olmalı ariflərin,
Eşq ömürlük mənə meyar olar.

Yar yox olmuşsa da vardır yenə,
Var isə, Şahin də o cür var olar.

*12.02.2002*

*292-ci gün*

**AĞLAYIR**

Bir gözüm açıq,
biri yumulu,
Biri - axtarır,
biri - ağlayır.
Ölüyə nə var,
diri - qəm çəkir,
Ölü susubdur,
diri - ağlayır.
Qonşular deyir
eşidib məni:
Yenə Tomanın
əri ağlayır.

*14.02.2002*

*294-cü gün*

**SƏBƏB**

Unuda bilmirəm səni...
Sözümdə qəm,
Gözümdə nəm,
üzümdə ələm,
Səni unuda bilmirəm.
Çünki,



onsuz da gedişin qəlbimə dağdır,
dağ üstdən dağ istəmirəm.
Çünki,
onsuz da yoxluğun fəraǧdır,
fəraǧ üstdən fəraǧ istəmirəm.
Çünki,
səni unutmaq istəmirəm...
Unuda bilmirəm səni...

*16.02.2002*

*296-cı gün*

**CANAN GERİ QAYITMAZ**

Bil bu anın qədrini,
Bu an geri qayıtmaz.
İstəsən də xətrini
Zaman geri qayıtmaz.

Gül tək saralıb gedən,
Canımı alıb gedən.
Canımda qalıb gedən
Canan geri qayıtmaz.

Şahin, olub acı çox,
Amma belə acı yox.
Dərdimin əlacı yox,
Loğman geri qayıtmaz.

*18.02.2002*

*297-ci gün*

## GÖZÜN MÜBARƏK OLSUN!

Əcəl, "mənimsən" dedin,
Sözün mübarək olsun.
Ey Əzrayıl, gəldiyin
İzin mübarək olsun.

Qorqud dədə, tap macal,
Sazını əlinə al,
Bir vida havası çal,
Sazın mübarək olsun.

Yaz da gəldi, ey sənəm,
Sənsizliyin yazı - qəm,
Deyə bilməyəcəyəm,
"Yazın mübarək olsun".

Əcəl sənə baxır ki...
Çox gözlədin... Axır ki,
Şahin, canın çıxır ki,
Gözün mübarək olsun!

*19.02.2002*



*299-cu gün*

## YAŞ BAŞIMI ÇAŞDIRIB

"Pəncərədən daş gəlir...",
Daş başımı çaşdırıb.
"Xumar gözdən yaş gəlir..."
Yaş başımı çaşdırıb.

Yumruq var daş sındırır,
Daş var daş - qaş sındırır,
Başsız var baş sındırır,
Baş başımı çaşdırıb.

Şahinəm, uçuşum var,
Xəyal adlı quşum var.
Quş dedi ki, "huşum var"...
Quş başımı çaşdırıb.

Söz qoca, məna qoca?
Bağ qoca, səhra qoca?
Mən qoca, dünya qoca?
Yaş başımı çaşdırıb.

Bu şerin sonu gəldi,
Qafiyəsi seyrəldi.
Yarım qəbrə yönəldi
Yaddaşımı çaşdırıb.

*21.02.2002*

*300-cü gün*

## QUŞ TƏKİ ƏLİMDƏN UÇDU...

Çiynimə söz yükləyirəm,
Hər hambalın işi deyil.
Bu qəmlər ki mən yeyirəm,
Dişim adam dişi deyil.

İşim aydın, gücüm əyan,
Şahindəki iş-gücə yan,
Uğuruma diş qıcıyan,
Üçü deyil, beşi deyil.

Aman, könül yenə şəkkli,
Fərəh - susub, qəm - tütəkli,
Qadınsa da hər ləçəkli,
Hər bığlı kəs kişi deyil.

Quş təki əlimdən uçdu,
Uyu, ey sevgilim, uyu.
Kim bilmir ki, əcəlin bu
Sonuncu gəlişi deyil...

*22.02.2002*



*302-ci gün*

## TALEYİMİN TƏKƏRİ

Tamrida
yoxdur daha...
Qaldı neçə tək əri,
amma hələ fırlanır
taleyimin təkəri.
Günlərin bir günündə
saxlamayıb onu sağ
o təkər dayanacaq,
tərk edəcək məni qəm,
sevgilimin yanına
sevinc arabasıyla
ömürlük gedəcəyəm,
qucacağam məzarda
mən də onun tək
yeri.
Amma hələ fırlanır
taleyimin təkəri...
Ulu Tanrı, ulu haqq
Məsləhət bildiyi vaxt
onu dayandıracaq...
Haçan dayandıracaq?
Bu onun əlində - sirr.

Tale də əlindədir,
təkər də əlindədir.
Amma hələ fırlanır
taleyimin təkəri...
Qaldı necə tək əri...

*24.02.2002*

*303-cü gün*

## QƏZƏL

Gül çöhrənə çoxdandır, yarım, nəzərim yoxdur,
Bundan xəbərim var ki, səndən xəbərim yoxdur.

Yoxdur, ikilik bitdi, dərviş təki tək qaldım,
Sən söyləməliydin ki, "tək qaldım, ərim yoxdur".

Sənsizlik üzündəndir cismimdə hünərsizlik,
Küsmüş deyə ilhamım əlbət hünərim yoxdur.

Bir kimsə əta etmir qiymət mənə çoxdandır,
Əldən dəyərim çıxmış, neynim, dəyərim yoxdur.

Yox xeyri bu dünyanın, xeyrim sən idin təkcə,
Qalsam - mənə zillətdir, ölsəm - zərərim yoxdur.

Xülyayə alışmışdım, xülya məni bezdirdi,
Xülya göyünə doğru çoxdan səfərim yoxdur.

Qoy bir də sənə, Şahin, zərgər deməsin kimsə,
Söylərsə əgər qafil, bildir ki, zərim yoxdur.

*25.02.2002*



*305-ci gün*

## QƏZƏL-TƏZMİN

"Nə xoşdur söhbəti yarın bahar əyyamı bağ ilə,
Nə çarə kim, ələ gəlməz əgər gəzsəm çıraq ilə".*

Yanımda olduğun əyyam əyilmişdi qəmin qəddi,
Kənarımda bu gün, yarım, durur qəm təmtəraq ilə.

Qalıb gendə yaxın dəmlər, yaxın günlər ki sən vardın,
Uzaqlaşdım yaxın gündən, yaxınlaşdım uzaq ilə.

On aydır bir də on bir gün, nələr çəkdim fərağından,
Əzəl gündən bilirdin sən aram yoxdur fəraq ilə.

Mənim cüzi işarəmdən qopardı bağrı hicranın,
Deyil mümkün qovum indi o hicranı çomaq ilə.

Şərabından ki sərməstəm coşubdur intihar eşqim,
Bıçağı gizləmə, saqi, işim vardır bıçaq ilə.

Saçımdan ağ kənar olmur günümdən qarə, ey yarım,
Qara gün bəhsə girmişdir bu gün hiddətlə, ağ ilə.

Ağırdım mən ki Şahdağdan, varaqdan yüngüləm indi,
Bu gün Şahin səninlən yox, edir söhbət varaq ilə.

*27.02.2002*

---

* Beyt Mirzə Ismayıl Məhzunundur (XIX əsr)

*306-cı gün*

## TANRIYA SUAL

Köməyin hanı,
hanı pənahın?
Hanı evimdə
o gözəl səda?
Tənəzzülü var
hər intibahın,
Olumum sual,
ölümüm nida!
Yaşayıramını?
Etdi bu Şahin
Yara əlvida,
rüzgara vida!

*28.02.2002*

*307-ci gün*

## YERDƏN BEZMİŞƏM

Hər böhtandan, hər yalandan,
Şərdən bezmişəm.
Əl çəkmir dillər yalandan,
hərdən bezmişəm.

Cavan idim pir qalmışam,
Özümə də sirr qalmışam.



İki idim, bir qalmışam,
Birdən bezmişəm.

Meyxanəyə meyl etmirəm,
Cananəyə meyl etmirəm,
Dürdanəyə meyl etmirəm,
Dürdən bezmişəm.

Duman oldum, dumanı qov,
Güman oldum, gümanı qov,
Mən şeyxi, mən şamanı qov,
Pirdən bezmişəm.

Buxar oldum, buxarı çək,
Allah, məni yuxarı çək.
Zəmzəm gərək, Kövsər gərək,
Kürdən bezmişəm.

Əriyirəm, zərdən qopar,
Çürüyürəm, yerdən qopar,
Tanrım, məni göyə apar,
Yerdən bezmişəm.

*1.03.2002*

*308-ci gün*

## QƏLƏM, VARAĞI YANDIRMA!

Əlim, çırağı yandırma,
Pərvanə var çıraq üstdə.
Qələm, varağı yandırma,
Sözüm yanar varaq üstdə.

Həyatdakı təzada bax:
Ağda qara, qarada ağ...
Sinəmdə od, qəlbimdə dağ,
Yanmaqdadır od dağ üstdə.

Yazdır, sözüm gül qədərdir,
Düzən aldır, çəmən zərdir.
Şahinə bax, səməndərdir,
Sanki yanır ocaq üstdə.

Yarpaq budağın altında,
Budaq yarpağın altında...
İnsan torpağın altında,
Sözsə qalır varaq üstdə.

Mən qalmışam, gedib yarım,
Vəfasızdır vəfadarım,
On aydır ki, göz yaşlarım
Naxış düzür yanaq üstdə.

Kəsildi həyatın sənin,
Unudulmaz yadın sənin,
Möhürləndi adın sənin,
Möhür kimi dodaq üstdə.

*2.03.2002*



*309-cu gün*

## O SEVGİ

Sənsizəm,
sənsizlik
zarafat deyil.
Yaşayıram,
amma həyatım
o həyat deyil.
İşləyirəm,
amma gücüm, qüvvəm
tükənməkdədir,
tam deyil.
Yazıram,
amma ilhamım
o ilham deyil.
Tutiləşirəm,
sanki dilimə
qaynaq ediblər
sənin adını,
Ölürəm,
sənsizliyim
məni ölümə sövq edir.
Sevmirəm heç bir qadını,
çünki sevgim
O sevgidir,
o sevgidir!!!

*3.03.2002*

*310-cu gün*

## İLAN İLİ, AT İLİ...

2001-ci il
ilan ili idi,
gəldi,
həyatımı zəhərlədi.
İlan bizi nəzərlədi,
Xoş günlərimizə
ilan nəzəri dəydi,
tənha qoydu, tək qoydu
səni də,
məni də...

İndi 2002-ci ildir,
At ilidir -
murad ilidir,
Xoş gəlibdir at ili!
Xoş günlərim itdi,
Ömür ağacının
yaşıllığı bitdi.
İndi
rəngsaz fələk
üzümə sarı çəkir.
Xoş gəlibdir at ili!
At məni
sənə sarı çəkir,
qəbrinə sarı çəkir...

*4.03.2002*



*311-ci gün*

## BİZİ QOVUŞDURACAQ

Nə deyim, nə söyləyim
Mən həyata bilmirəm.
Var gücümlə qaçıram
Sənə çata bilmirəm.

Həyat ayırdı bizi,
Ölümün gücünə bax:
Öldürüb mən sənsizi
Bizi qovuşduracaq.

*5.03.2002*

*312-ci gün*

## QƏZƏL

Sevmişdi könül gül kimi bir yar, o yoxdur,
Bağ içrə bu gün hər cürə gül var, o yoxdur.

Yaz fəsli gəlibdirsə də, şənlənməyirəm mən,
Quşlarla dolubdur yenə gülzar, o yoxdur.

İsrar ilə bağban çağırır bağına hər gün,
Yox, eyləməsinlər daha israr, o yoxdur.

Hər qəmliyə qəmxar gərəkdir, dedilər ki,
Ey qəmli, tapılmaz sənə qəmxar, o yoxdur.

Bilməm nə xəta eyləmişəm mən qaragünlü,
Bəxtimmi buna oldu səbəbkar, o yoxdur.

Solduqda həyatı o gülün - dərdi göyərdi,
Etmiş məni min dərdə giriftar, o yoxdur.

Viranə qalıb, Şahina, könlüm, hanı memar?
Vacibdi könül mülkünə memar, o yoxdur.

*6.03.2002*

***313-cü gün***

## QƏZƏL

Dünən dildar varımdı, bu gün dildarı qeyb etdim,
Vəfasız yarlər çox var, vəfalı yarı qeyb etdim.

Bu gün sevgim mənim yoxdur məgər vardırmı inkarı?
Mənəm inkarı inkar eyləyən, inkarı qeyb etdim.

Dünən qəmlər kənar idi könüldən, bəxtəvərlikdi,
Hücum etməkdədir qəmlər bu gün, qəmxarı qeyb etdim.



Mənim yoxdur bu gün şadlıq evimdə ney ki, sındırdım,
Kamanı qaldırıb vurdum yerə, mən tarı qeyb etdim.

Gül idi gül bağında, gül bağından gül kənar oldu,
Qərənfildi, sənubərdi, heyf, gülzarı qeyb etdim.

Bu gün təklif edirlər zər mənə, zərsizliyim xoşdur,
Zərində yox gözüm, zərgər, çəkil, mirvari qeyb etdim.

Könül mülküm mənim viran olur hər ləhzə, ey Şahin,
Bu gün yoxdur nizamı mülkümün, memarı qeyb etdim.

*7.03.2002*

***314-cü gün***

## 8 MART

Keçən il
təbrik eləmişdim səni,
can sağlığı diləmişdim sənə,
Bayramın idi,
bayramım idi,
çünki sən vardın,
çünki sən mənə yardın...

Bu il
təbrik edə bilmirəm səni,
Bayramın deyil,
bayramım deyil,
çünki sən yoxsan,
çünki keçən il
keçdi tuği-lənət kimi boğazıma,
əllərimdən əllərini qopardı,
ölüm səni apardı.
Bayramım deyil
bu ilin 8 martı.

Daha bayramım deyil
"8 mart" adlı bayram.
Qoy mənə
asi şair desinlər,
bu bayramdan
narazı şair desinlər,
qoy məni tənqid eləsinlər,
mən belə bayram tanımıram.

Yoxsan bu dünyada,
8 mart
yoxluğunu saldı yada...

*8.03.2002*



*315-ci gün*

## QƏZƏL

Bağban əlini çəkdi çəmənzarə, göyərdi,
Qış fəsli ki yer vermiş idi qarə, göyərdi.

Qəlbim paralandı, elə bildim ki, ölübdür,
Qəlbimdəki amma mənim hər parə göyərdi.

Zənn eyləməsinlər ki külüng oldu göyərdən,
Fərhadın əli dəymədi dildarə, göyərdi.

Qətl eyləsələr arif olan şəxsi qaralmaz,
Mənsuri çəkən ləhzə fələk darə, göyərdi.

Gündən-günə hər yarə qaralsın gərək, amma
İqbalə baxın, məndəki hər yarə göyərdi.

Fəvvarələnib gözdəki yaş yarım öləndən,
Fəvvarəmə olmaz daha bir çarə, göyərdi.

Hər şey ki göyərmir onu ölmüş bilir aləm,
Şahində ömürlük daha fəvvarə göyərdi.

*9.03.2002*

*316-cı gün*

## QƏZƏL

Dəhşətli an idi səndən ötrü,
Müdhiş zaman idi səndən ötrü.

"Yaxşı" sözünü unutmuş idim,
Halım yaman idi səndən ötrü.

Qeyb olmuş idi gülüş dodaqdan,
Ahü fəğan idi səndən ötrü.

Dərman ilə olmayırdı çarə,
Hər həb ziyan idi səndən ötrü.

Günlərlə şəfa umub təbibdən,
Yar qəlbi qan idi səndən ötrü.

Göz - cismini natəvan görürdü,
Can - natəvan idi səndən ötrü.

Sanki səni Rəbb sınağə çəkdi,
Dərd imtahan idi səndən ötrü.

Təbim də yox oldu yoxluğunda,
Şerim bəyan idi səndən ötrü.

Sözlər acı oldu sanki dildə,
Dil mehriban idi səndən ötrü.



Heç kimsəyə olmur indi sevdam,
Sevda əyan idi səndən ötrü.

Hərçənd cavan deyildi Şahin,
Amma cavan idi səndən ötrü.

*10.03.2002*

*317-ci gün*

## QƏZƏL

Taleyim etdi məni gör necə yarımdan uzaq,
Düşmüşəm bir neçə aydır ki, nigarımdan uzaq.

Getməyir xatirəsi, sevgisi bir dəm candan,
Olmayır qüssəsi bir ləhzə kənarımdan uzaq.

Əzrayıl, gül kimi cananımı aldın məndən,
Elədin sən məni gül fəsli baharımdan uzaq.

Yalvarış fikri yoxumdur, gəlib öldür məni də,
Edə bilməz məni bir kimsə vüqarımdan uzaq.

Məni öldür ki, gedib yarı görüm cənnətdə,
İstərəm onsuz olum mən bu diyarımdan uzaq.

Kimə lazımsa aparsın, atıram mizrabı,
Əllərim tarə toxunmur, yenə tarımdan uzaq.

Şahinəm, yar qübarı elə məhrəmdir ki,
Olmaram həşrə qədər mən bu qübarımdan uzaq.

*11.03.2002*

## SAAT 2-YƏ 1 DƏQİQƏ QALMIŞDI

Döşəməsilən əski ağacını
stula bağlamışdılar
dərman şüşəsini ağaca.
Müalicədən söz aça-aça
onun şah damarına
dərman yeridirdilər,
sanki
get-gedə cansızlaşan bədəninə
can yeridirdilər,
amma bilirdilər ki,
müalicənin xeyri yoxdur.
Amma görürdülər ki,
gözləri öləziyir,
seyri yoxdur,
amma sanki yenə
nəyəsə ümid bağlayırdılar...
Bacıları ağlayırdılar,
balaları onlardan betər,
müalicə
zərrə qədər



vermirdi səmər...
Gözlərini tavana dikmişdi,
tez-tez dərirdi nəfəsini,
yəqin ki eşidirdi
Əzrayılın addım səsini,
bizsə eşitmirdik,
Tanrıya dua edirdik
ki, kömək etsin ona,
ömrünü artırsın bir az,
həm də bilirdik ki,
Tanrı işinə qarışmaq olmaz...

Gecə yarısı
Maşınıma -
dəmir atıma minib çapdım,
sanki
tez geri qayıtmağa
can atan çapardım...
Şəfqət bacısını evinə apardım.
O, yolda məni
etdi ümidvar,
Dedi ki,
hələ ümid var...

Nazilə bacımı da çatdırıb evinə
ümidlə qayıtdım evə,
ümidsiz oldum amma.
Daha fəğan etmirdi,
kimsəni eşitmirdi,
bacılar ağlayırdılar,
balalar onlardan betər,
Müalicə verməmişdi səmər.
Daha bir neçə dəqiqə keçdi
Və... ölüm şərbətini içdi,
artıq Əzrayıl canını almışdı,
gecəydi,
saat 2-yə 1 dəqiqə qalmışdı.

*12.03.2002*





## QƏZƏL-TƏZMİN

Bir-bir düzülə, ey pəri, yan-yanə yanında,
Olmaz sənə tən bircə də cananə yanında.

"Rüxsarın əgər cənnət olur aşiqə daim,
Düşdüm niyə mən atəşi-suzanə yanında?". *

Pərvanəm idin, bəs niyə qoydun məni yalqız,
Yanmaqda idim şam kimi pərvanə yanında.

Bir kimsə daha olmayacaqdır mənə məhrəm,
Qoydun məni bica yerə biganə yanında.

Bundan belə heç kəs məni məsciddə görməz,
Ya da görə bilməz daha meyxanə yanında.

Ölməzsəm əgər olmayacaqdır mənə çarə,
Ölsəm yetərəm, ey pəri, dərmanə yanında.

Vəsl imkanı yoxdursa da yoxdur buna meylim,
Şahin yetəcəkdir fəqət imkanə yanında.

*13.03.2002*

* Beyt Quba "Gülüstan" ədəbi məclisinin üzvü olmuş Mirzə Möhsün Xəyali (1824-1904) adlı bir şairindir.

## QƏZƏL

Oldu günüm qarə, itirdim səni,
Tapmayıban çarə itirdim səni.

Getdi səninlən canımın yarısı,
Oldu ciyər parə, itirdim səni.

Gör neçə aydır ki, toxundurmuram
Mizrabımı tarə, itirdim səni.

"Bəstənigar"ın səsi gəlmir daha,
Susdu "Zəminxarə", itirdim səni.

Bitdi sevincim ki, gözümdən mənim
Axmada fəvvarə, itirdim səni.

Üz tuturam gündə məzarıstana,
Oldu ayaq yarə, itirdim səni.

El sənə, ey yar, dedi "çarəsiz",
Şahinə "biçarə", itirdim səni.

*14.03.2002*





## YARIMIN TORPAQDA QƏBRİ VAR İNDİ

Səmada şahindim, kiçilir yaman
Hüdudum get-gedə, həddim get-gedə.
Məni torpaqsevər elədi zaman,
Torpağa əyilir qəddim get-gedə.

Dilində "rahatlıq" sözü yox idi,
Yaman səbirlidir, səbri var indi.
Yarımın torpaqda gözü yox idi,
Yarımın torpaqda qəbri var indi.

Dözüm daha tutmur canımda qərar,
Dözüm dözümünü yığım-yığımda.
Addımım altından qopan toz ki var
Günəşə çatardı cavanlığımda...

*15.03.2002*

## GÜLSÜZ GÜLDAN

*(Qaragün şairin ağ şeri)*

Lənkərandaydım...
Döndüm Bakıya,
Çatdım evimə,
Açdım qapımı,
girdim içəri
hər şey vardı
səndən başqa,
heç kim yoxdu
məndən başqa...
Soyuq xörək,
köhnə göyərti,
duzsuz duzqabı,
dolu zibildan,
yarımçıq araq şüşəsi,
dəmlənməmiş çay,
yuyulmamış boşqab,
yağlı qaşıq,
qapaqsız qazan,
qazansız qapaq,



palçıqlı ayaqqabı,
kirli xalça,
tozlu süpürgə,
süpürülməmiş döşəmə,
cütlənməmiş başmaq,
böyrü üstə yıxılmış ütü,
ütülənməmiş şalvar,
əzik-üzük köynək,
qırışmış qalstuk,
döşəməyə düşmüş qəzet,
dolaba qoyulmamış kitab,
çərtilməmiş qələm,
cırılmış varaq,
gözü yumulu zərrəbin,
ağzı açıq qayçı,
dişi sınıq daraq,
ağlayıb qurtaran şam,
sönmüş kibrit dənələri,
sənsizləmiş mənzil,
dayanmış saat,
üstünü toz basmış divan,
bir sözlə,
gülsüz güldan
baxırdı mənə...

Dörd gün açılıb bağlanmamış qapımı
bəxtim kimi bağladım.
Bir vaxt sənli,
indi sənsiz
evimi -
dağılan tifaqımı,
gülsüz güldanımı
görüb
ağladım...

Gülsüz güldan,
Sənsiz mən...

*16.03.2002*

***323-cü gün***

## QƏZƏL-TƏZMİN

Gəldi novruz, gəlmədi, amma baharım gəlmədi,
Saqi gəldi, mey də hazırdır, xumarım gəlmədi.

"Bülbüli-şeyda kimi naləm tutubdur aləmi,
Sərv qədli məhcəbinim, nazlı yarım gəlmədi".*

* Beyt Şuşa "Məclisi-fəramuşan" ədəbi məclisinin sədri olmuş Mir Möhsun Nəvvabındır (1833-1919)



Yol çəkən gözlər deyirlər intizarı zar edir,
Gözlərim yol çəksə də hər dəm, nigarım gəlmədi.

İffəti iqbalım oldu, xisləti fəxrim mənim,
Getdi əldən iftixarım, iftixarım gəlmədi.

İndi adəm görmürəm mən, yoxsul olsun mən kimi,
Eşq imiş aləmdə varım, yoxdu varım, gəlmədi.

İxtiyar olmazsa olmaz ixtiyarı kimsənin,
İntizarəm ixtiyarə, ixtiyarım gəlmədi.

Ey nigarım, göydəsən, Şahinsə göydən gen düşüb,
Yerdəyəm, çünki hələm göydən qərarım gəlmədi.

*17.03.2002*

*324-cü gün*

## QƏZƏL

Eşqi duymaz kəsə cahil desələr doğru olar,
"Yeri tərk et, yerini bil" desələr doğru olar.

O səbəbdən ki sevinc hissimi qətl eyləmişəm,
Bu səbəbdən mənə qatil desələr doğru olar.

Keçən il dəfn elədim yarımı öldüm mən həm,
O ili ömrümə sahil desələr doğru olar.

Hər kamal əhlinə kamil deyənin əqli dayaz,
Sədiyə, Hafizə kamil desələr doğru olar.

Xəlqinə, millətinə, dövlətinə zülm eləyən
Şəxsə hər yerdə əzazil desələr doğru olar.

Bənzəsən Məcnuna divanəliyi eylə qəbul,
Elə divanəyə aqil desələr doğru olar.

Şerdə fəzlimi, fəzliyyətimi dərk eləyən
Dedi ki, Şahinə fazil desələr doğru olar.

*18.03.2002*



*326-cı gün*

## QİTƏ

Eşq bağında bitən canlı gül idin mənə sən,
Çiçəyin solsa da, ətrin çiçəyimdən getməz.

Görməyirsən məni artıq, nəzərin sönmüşdür,
Nəzərim gər sönə əksin bəbəyimdən getməz.

Gözəlim, qəlbimi eşqin elə zəbt etmiş ki,
Gər başım getsə də, eşqin ürəyimdən getməz.

*20.03.2002*

*328-ci gün*

## QƏZƏL

Hər tərəfdə bu nə qəmdir ki, dəmadəm görürəm,
Daha heç yerdə sevinc görməyirəm, qəm görürəm.

Qəmli görmüş əsl aşiqləri şairlərimiz,
Heç yazan oldumu aşiqləri xürrəm görürəm.

Görürəm bağdə güllərdəki şəbnəm çoxalıb,
Şəbnəm üstdə gözümün yaşını şəbnəm görürəm.

Neçə aydır ki, məni tərk eləyib getmişsən,
Neçə aydır ki, fəqət hüzn ilə matəm görürəm.

Söyləyirlər ki, zaman dərdi sağaldır, amma
Heç quru görməyirəm gözlərimi, nəm görürəm.

Hər ilin bir ayı məlum ki, məhərrəmlikdir,
Amma mən ildəki hər ayda məhərrəm görürəm.

Sanmasınlar səni görmür daha Şahin Fazil,
Gözümün ayinəsində səni hər dəm görürəm.

*22.03.2002*

***331-ci gün***

## QƏZƏL

Sevinc olmaz, fərəh qalmaz könül mülkündə - zar olsa,
Gülər güllər lətafətlə könül bağı bahar olsa.

Məni tənha qoyub getdin və dağlandı sinəm qəmdən,
"Gedərmi daği-hicran cümlə aləm laləzar olsa?" *

---

* Beyt Quba "Gülüstan" ədəbi məclisinin üzvü olmuş Hacı Qubbeyinindir.



Ürəkdə öylə sirrim var ki, bilməzsən mən ölməsəm,
Deyərlərmi məgər sirr sirrə sirrim aşikar olsa?

Ədular qartıyıb qalmış diyarımda nə müddətdir,
Ədunun zülfü qar olmaz əlimdə zülfüqar olsa.

Məzəmmət eyləyirsənmi məni sağ qaldığımçün sən,
Deyirdim qalmaram yarım kənarımdan kənar olsa.

Ümid bağçamda gül yoxdur bu gün, bağibanım yoxdur,
Ömürdən həzz alan olmaz ümidlər tarimar olsa.

Qalıb qış fəslinin son pilləsində binəva Şahin,
Ölərdim mən bu dəm, ey yar, əlimdə ixtiyar olsa.

*25.03.2002*

***333-cü gün***

## QƏZƏL

Mən kəsməyirəm kəlmə o yar ilə haçandır,
Söhbətləşirəm evdə divar ilə haçandır.

Mizrabı götürmür əlinə, qəmli bu şəxsin
Ünsiyyəti olmur daha tar ilə haçandır.

Ya bağdakı güllər və çiçəklərlədi söhbət,
Yaxud danışır sərvü çinar ilə haçandır.

Meyxanə də çəkmir onu, məscidə də getmir,
Dolmuş sinəsi dərdü qübar ilə haçandır.

Bitməkdə fəqət hər gecəsi nalə səsiylə,
Ötməkdə günü ah ilə, zar ilə haçandır.

İran ilə əfqan eli, həm Türkiyə görmür,
Çoxdan onu istəkli nigar ilə haçandır.

Qalmış məzarıstanə gələn heyrət içində:
Şahin danışır gündə məzar ilə haçandır.

*27.03.2002*





## QƏZƏL

Mənə çox zülm eləyibdir, yenə dünya eləyir...
Aşiqiylə nə üçün bir belə qovğa eləyir?

Yarımı aldı əlimdən, belimi sındırdı,
Gözlərim yaş ki axıtdı, neçə dərya eləyir.

Söyləmişdim onu gördükdə təəccüblənibən:
"Allahın nurimi hüsnündə təcəlla eləyir?"

Öz gözümmü özümə dəydi məni zar elədi?
Dərdim, ey Qeys, mənim bir neçə səhra eləyir.

"Qulhuvəllahu əhəd" əzbəri olmuş dilimin,
"Ləm yəlid" sözləri çox mətləbi mənа eləyir.

Məsləhətdir bizə, ey dil, fəqət Allah bilən,
Fəqət Allahdı hər illəti peyda eləyir.

Böyləsə bəs nə üçün ah edirəm mən bu qədər,
Şahina, Rəbb eləyir hər nə təmənna eləyir.

*30.03.2002*

*338-ci gün*

## QƏZƏL

Sakit olmur dəli təbim, yenə qovğa edəcək,
Dərdimi yazsam əgər mən neçə misra edəcək.

Ya Qeys, səslə məni bir də gəlim Bağdadə,
Təki hökm eylə, bu aşiq səni peyda edəcək.

Qoy ki səhra göyərə, sən dəli, mən divanə,
Yaş axıb gözlərimizdən iki dərya edəcək.

Yarımı aldı əlimdən bu amansız dünya,
Bircə-bircə sayalar dərdimi dünya edəcək.

Xeyri yox gəlsə də gər türfə gözəllər yanıma,
Tək onu, bircə onu qəlb təmənna edəcək.

Niyə tərk eylədi yarım məni, tək qaldım mən,
Bu qoca həşrə kimi çərx ilə dəva edəcək.

Hələ dünya tanımır Şahini, Allah qoysa,
Hələ bundan belə dünya ilə qovğa edəcək.

*1.04.2002*



*339-cu gün*

## QƏZƏL

Yaz gəldi, çəmən güldü, yox məndə çəmən meyli,
Yalqızlığadır meylim, yox lalə-süsən meyli.

Sevdayə münasib yer axtarmada aşiqlər,
Fərhaddə - dağ şövqü, Məcnunda - düzən meyli.

Meyxanəyə meylim yox, amma çağırır tez-tez,
Öldürməyəcək saqi qəlbimdə həmən meyli.

Yar öldü, gözüm tökdü mirvari təkin yaşlar,
Mirvarini yığmaqçın var indi ləyən meyli.

Qəlbimdə Məhəmməddir, könlümdə Hüseyn şövqü,
Xoşbəxt o müsəlmandır var isə Həsən meyli.

Üqbayə təmənnalı bir bəxtəvərəm mən də,
Vardır əbədi məskən, daimi vətən meyli.

Şahin, sənə ağ köynək təklif eləyir dərzi,
Dərzi, nə gərək köynək var isə kəfən meyli.

*2.04.2002*

## QİTƏ

Bəxtəvər idim necə mən, ey fələk,
Kükrədi qəlbimdə tələşım mənim.

Sısqa bulud eyləməsin iftixar,
Axmadadır sel kimi yaşım mənim.

Mən ki savaş etməz idim, indisə
Hicr ilə başlandı savaşım mənim.

Hicrə yavaş ərz eləyərdim qəmi,
Dad eləyir indi yavaşım mənim.

Şükr eləyirdimsə əgər bəxtimə,
İndisə var dava-dalaşım mənim.

Görməyirəm baş, görürəm baş daşı,
Gör ki nələr çəkmədə başım mənim.

*3.04.2002*





## QƏZƏL

Cahil adamdan yenə şər dəymədə,
Aqilə, eyvah, xətər dəymədə.

Heç nəzərə gəldimi əğyar olan?
Aşiqə hər ləhzə nəzər dəymədə.

Eşq dəyərdir ki, dəyər aləmə,
Az nəzərə öylə dəyər dəymədə.

Dilbərimi qeyb elədim, görmürəm,
Qüssə - hücum etdi, kədər - dəymədə.

Dərd deməyin dərdimə - top gülləsi!
Qəm mənə ondan da betər dəymədə.

Gül becərənlər niyə gülsüz qalır?
Bağbana güldən nə səmər dəymədə?

Ey pəri, Şahin dəxi ölmək dilər,
Gözlərimə son o səfər - dəymədə.

*5.04.2002*

*344-cü gün*

## SÜRUD

Yenə gözlərdə hüzn var, yenə sözlər dindi,
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.
Varlığın varlığımın varlığı idi, indi
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

Güc verib, qüvvə veribdir nə qədər mərdə qələm,
İndisə fikrimi sövq etmədədir dərdə qələm,
Yoxluğun əlləri varmış və o əllərdə - qələm,
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

Yetişəndən bəri mən səmtə ağır hicr anı,
Həmdəm etdim özümə ayrılığı, hicranı,
Oluram indi isə yoxluğunun qurbanı,
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

İndi dağ boyda qəməm, qüssə-məlaləm, bildim,
Sənə yetməkdədi gündüz-gecə naləm, bildim,
Yoxluğun qüvvəsi varmış, bunu mən həm bildim,
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.



Heç nəyim yox közüm üstündə külümdən başqa,
Daha mən görməyirəm heç nə zülümdən başqa,
Görmək üçün səni yol varmı ölümdən başqa?
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

İki dünyanı görübsən, mən isə bircəsini,
Göyə uçdun uçurub yerdə olan məhbəsini,
Yaxşı ki, dinləmək üçün yenə göyçək səsini,
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

Dil ki bədbinliyə inkar idi, lakin söylər,
Yenə çəngində qalıb qüssəvü ahin, söylər,
Dərk edib yoxluğunu indi bu Şahin söylər:
Yoxluğun varlığımın üstünə xətt çəkməkdə.

*7.04.2002*

*345-ci gün*

## QƏZƏL

Dönməz bu məkanə, bir də gəlməz,
Gəlməz, o zəmanə bir də gəlməz.

Gəlməz daha dilbərim, gedibdir,
Fani bu cahanə bir də gəlməz.

Ruhi onu tərk edib yox oldu,
Cansızdı ki, canə bir də gəlməz.

Eşq içrə vəfa nişanəsiydi,
Heyfa, o nişanə bir də gəlməz.

Donmuş qanımın buzu açılmaz,
Eşq istisi qanə bir də gəlməz.

Əfsus ki, xoş günüm yox oldu,
Yoxdursa - bəyanə bir də gəlməz.

Öylə qapanıb könül dükanım,
Sevda bu dükanə bir də gəlməz.

Mən görmədəyəm onu xəyalən,
Əlbəttə, əyanə bir də gəlməz.

Şahin, bu məkan onu itirdi,
Dönməz, bu məkanə bir də gəlməz.

*8.04.2002*



*346-cı gün*

## QORXU

Bu gün
havada isti var,
məndə - soyuq.
Soyuqlamışam.
Deyirlər
şəhərdə virus yayılıb...
Zökəm olmuşam...
Bu gün gəlmədim qəbrin üstünə,
çünki,
virusun nə vecinə,
Qorxdum ki,
zökəmim
keçə
sənə.

*9.04.2002*

*347-ci gün*

## QƏZƏL

Dərdi içdirdi fələk mey kimi cam ilə mənə,
Qüssəni, qəm-kədəri verdi nizam ilə mənə.

Kimə bir qətrə əta etdi, kimə bir damcı,
Amma ki cövrünü bəxş etdi tamamilə mənə.

Qəbri üstündə görürlər məni yarın tez-tez,
Arabir "molla" deyirlər bu məqam ilə mənə.

"Əlvida" söyləmədi, etmədi vəsiyyətini,
Dikibən gözlərini baxdı davam ilə mənə.

Mən köçərkən yanına yar məni dindiribən
Görəsən söz deyəcək hansı kəlam ilə mənə?

Vaxtı yoxdur, belə zənn eyləyirəm, Əzrayılın,
Sevinərdim nəzər etsəydi qiyam ilə mənə.

Ələ, ey saqi, alıb badə, gəlibsən yanıma,
Qovaram, düşmə yaxın bir də haram ilə mənə.

Məni bezdirmədə, billah, "əleyküm-salam"ın,
Nə "əleyk" ilə xitab et, nə "salam" ilə mənə.

Qəzəli mən ki edib xəlqi, cəfalar çəkdim,
Şahinəm, varmı ölüm böylə məram ilə mənə?

*10.04.2002*



*349-cu gün*

## QƏZƏL

Sənsizliyim indi zarə bais,
Hicrindi bu intizarə bais.

Qəm çoxdu, qübar həddən artıq,
Sənsən bu qəmə, qübarə bais.

Bais o acı fərağın hüznə,
Gizlin deyil, aşikarə bais.

Ağ idi günüm ki gəldi qarə,
Qarə günümə o qarə bais.

Getdin, təzə bir məzar artdı,
Oldun təzə bir məzarə bais.

Ey əzrayılım, yolunda göz var,
Ol gözlədiyim qərarə bais.

Gəl Şahini həm apar məzarə,
Çəkmə özünü kənarə, bais!

*12.04.2002*

*350-ci gün*

## QİTƏ

Heç kəsi görməyirəm mən, buna bais gözdür,
Hamını əks eləmir gözlərimin aynası.

Oxuyurlar və deyirlər ki "nə olsun, sözdür...",
Hamıya bəlli deyil sözlərimin mənası.

Gecədir, ulduz oyaqdır, ay oyaqdır, mən oyaq...
İtirəndən yarı itmiş gözümün röyası.

*13.04.2002*

*351-ci gün*

## QƏZƏL

Yalqızam mən qəbir üstündəki baş daşı kimi,
Kim olar Şahinə sirdaş o sirdaşı kimi?

Hifz edirdim onu şövq ilə cəvahir təhəri,
Aləmin ən bahalı incisi, daş-qaşı kimi.

Məni mahir eləmişdi fələyin keşməkeşi,
Qalmışam indi bir acız sayağı, naşi kimi.



Qələmim sındı belim tək, bu qələm məftuni
Kimsəni vəsf edə bilmir o qələmqaşı kimi.

Sənə sadiq bir adam var idi, yoxdur, Şahin,
Varmı indi sənə sadiq gözünün yaşı kimi?..

*14.04.2002*

*352-ci gün*

## MƏCNUN KİMİ...

Məzarıstan -
Matəmistan,
ya Zarıstan...
Ya da,
Ölülər evi...
İndicə Şəhristanda idim -
Dirilər evində.
İndisə
Ölülər evindəyəm ki...

Qəbir üstü...
İçində sən,
çölündə - mən.

Qəbir içi...
İçindəsən.
Qəbir çölü...
Çölündəyəm,
tükənib hövsələm, səbrim...
Qəbir yanı -
bugünkü boş yer,
yaxud
sabahkı qəbrim.

Qəbir üstü...
Ürəyimə damıb ki,
otaqda deyil,
yataqda deyil,
ey Leyli,
qəbrinin üstdə öləcəyəm
Məcnun kimi,
qəbrinin içinə
məftun kimi...

*15.04.2002*



*354-cü gün*

## QƏZƏL

Ey saqi, gətir badə, qədəh qan ilə doldu,
Yəni qədəhim qırmızı hicran ilə doldu.

Qəmlər və kədərlər gözümə dəydi cism tək -
Meyxanəyə fəryad ilə, əfğan ilə doldu.

Eldar təbib var idi Sina kimi gəldi,
Tibb elmi düşündüm yenə imkan ilə doldu.

Əfsus, əlac olmadı, heyhat, olan oldu,
Can verdi nigarım, ürəyim qan ilə doldu.

Mən dinc adam oldum uzun illər boyu, indi
Qəlbim fələyin cövrünə üsyan ilə doldu.

Rədd eylədi Şahin meyini, saqi, vüsalın,
Yəni qədəhim qırmızı hicran ilə doldu.

*17.04.2002*

## QƏZƏL

Ağ deyə bilmirəm əsla daha mən növrağə,
Çünki meydan oxumaqda qara günlər ağə.

Mən fələkdən həmi razı, həmi narazı kəsəm,
Gah mey süzdü əli, gah zəhər bardağə.

Ölürəm yarım öləndən bəri hər gün, yarəb,
Sağ deməzlər canı vardırsa da hər bir sağə.

Cumaram mən də onun yanına cəld addımla,
Ləngimək olmayacaq maniə mən qıvrağə.

Çoxu qorxursa da mən qorxmayıram ölməkdən,
Eləyən olmayacaqdır məni tay qorxağə.

Əkirəm ümmid olub Tanrıya ümmid toxumu,
Bağiban əkməyəni Şahin əkir torpağə.

*18.04.2002*





## QƏZƏL

Günlər keçir ahüzar içində,
Qəm, qüssə, kədər, qübar içində.

Cansız kimiyəm, canım canımmı?
Qandırmı axır damar içində?

Görsənsə də aşikar, çox sirr
Gizlənmədə aşikar içində.

Gözlər dikilibdir asimanə,
Var orda qıfıl... açar - içində.

Ulduz görünür gözə səmadən,
Kimdir ki, bilən nə var içində.

Qızdırma səni apardı, ey yar,
Getdin əriyib azar içində.

Cənnət bağının yolu açıqmı?
Vardırmı qapı məzar içində?

Ruhin məni gözləyir yəqin ki,
Qoydum səni intizar içində.

Üstündə yerin donur bu Şahin,
Bir günsə ölüb qızar içində.

*19.04.2002*

## SÜRUD

Ey məni min dərdə giriftar edən,
Pis günə qoydun bu giriftarını.
Ey yox olan qəmlərimi var edən,
Pis günə qoydun bu giriftarını.

Öndə kədər... Gendə qalıb yaxşı gün,
İndi günəş tək saralıb yaxşı gün,
Pis günü görcək qaralıb yaxşı gün,
Pis günə qoydun bu giriftarını.

Sevgiyə biz, sevgi bizə yar idi,
Birgə idik, Tanrı mədədkar idi,
Dəydi nəzər, yaxşı günüm var idi,
Pis günə qoydun bu giriftarını.

Qəm məni sövq etdi pərişanlığa,
Mən yazığa torba verin qəm yığa,
Bığ qarışıb saqqala, saqqal bığa,
Pis günə qoydun bu giriftarını.



Şivən edir dil və deyir “Yar... yar!..”
Çoxmu mənim tək yaralı yar var?
Oldu yetim bir qoca tək zar yar,
Pis günə qoydun bu giriftarını.

Gəldi bahar, amma xoşavaz deyil,
Qışdı mənimçin bu fəsil, yaz deyil,
Pis günümün ömrü mənim az deyil.
Pis günə qoydun bu giriftarını.

Tərk eləsə indi bu can Şahini,
Şad eləyər can yanan Şahini!
Pis günə qoydun qocaman Şahini,
Pis günə qoydun bu giriftarını.

*21.04.2002*

## QƏZƏL

Şad olmağa cəhd olsa da, cövrü sitəm artdı,
Qalxırsa da əllər göyə doğru, ələm artdı.

Aləm qəmini çəkməyə dəyməz bu cahanda,
Tarix boyu çox çəkdilər, amma ki qəm artdı.

Şah olmaq olar, bəlli ki, hər şah Cəm olmaz,
Cəm sahibi artıbsa da, sanmam ki, Cəm artdı.

Yar öldü, azaldıqca mənim hövsələm, amma
Məyusluğumun təntənəsi dəmbədəm artdı.

Vurdum başa "Qırxnamə"ni mən bircə qələmlə,
Yazmaq üçün "Ilnamə"ni dəftər-qələm artdı.

Səhradə nəmişlikdən əsər yoxsa da, Şahin,
Tanrım nə üçün bildi rəva gözdə nəm artdı.

*23.04.2002*





## QƏZƏL

Əlvida etdi mənə, öldü o yar, ölməliyəm,
Ürəyimdə bu cahan boyda qübar ölməliyəm.

Yaşayıb mən bu diyar içrə zülümlər çəkdim,
Məni çəkməkdə bu gün özgə diyar, ölməliyəm.

Ürəyim hamilədir sirrim ilə, doğmalıdır,
Ürəyim sirrimi etdikdə kənar, ölməliyəm.

Bir qərarım var idi: ölməliyəm səbr ölsə!
Nə səbr indi qalıbdır, nə qərar, ölməliyəm.

Var gümanım ki vüsal olmalıdır tezliklə,
Bu gümanə məni sövq etdi nigar, ölməliyəm.

Qəbrinin saxlanılıb bir yanı məndən ötəri,
Gözləyir sahibini indi məzar, ölməliyəm.

Dirinin sevgisi vardır diridə, ey Şahin,
İndi məndə ölünün sevgisi var, ölməliyəm.

*24.04.2002*

## YANAĞIN QIZARMAZ VÜSALƏ KİMİ

Gözüm gözlərinə deyir "mənə bax",
Canı göz nuruna yaxan deyilsən.
Elə bağlanıb ki, açılmayacaq,
Sən daha gözümə baxan deyilsən.

Yanağın qızarmaz vüsalə kimi,
Nə qızılgül kimi, nə lalə kimi.
Saçına bənzəyən şəlalə kimi
Çağlayan deyilsən, axan deyilsən.

Vüsalım ağlayır, hicranım gülür,
Yağmursuz gözümdən qan-yaş tökülür,
Mənim yaddaş qəsrim daş-daş sökülür,
Sənsə yaddaşımdan çıxan deyilsən.

*25.04.2002*





## QƏZƏL

Ömr keçirdim neçə sevda ilə,
Günləri verdim yelə xülya ilə.

Kim qovurub buğdanı qəlbim kimi?
Girmədəyəm bəhsə qovurğa ilə.

Aldı mənim yarımı öz qoynuna,
Qapqara torpaq təmənna ilə.

Yumruq ilə varsa da üstün gələn,
Qarşı çıxar kim mənə misra ilə?

Gəlsəm, ey Adəm, yanına cənnətə
Mən görərəmmi səni Həvva ilə?

Xeyli suallar dayanıb qarşıda,
Cəng edirəm rəmzü müəmma ilə.

Bir kərə gəldim cahana, sonradan
Mən yenə gəlləm neçə qovğa ilə.

Qırdı mənim ümmidimi, Şahina,
Çox savaşım var bu dünya ilə.

*26.04.2002*

*364-cü gün*

## SƏKKİZLİK

Artdıqca, ey sənəm, gözümün nəmi,
Gördüm yavaş-yavaş nəm çiçəklədi.
Gözümdən torpağa çilədim qəmi,
Qəbrinin üstündə qəm çiçəklədi.
Demədim, mən nələr, nələr gizlədim,
Hədər bildirmədim, hədər gizlədim...
Könül viranəmdə kədər gizlədim,
Kədər qönçələndi, həm çiçəklədi.

*27.04.2002*

*365-ci gün*

## QƏZƏL

And içib canına inşaallah,
Gələrəm yanına inşaallah.

Tab edə bilməyəcəkdir könlüm,
Acı hicranına inşaallah.

Olaram daimi mehman, ey yar,
Məzarıstanına inşaallah.

Burda zənn eyləyirəm son qoyulub
Orda əfğanına inşaallah.

Cənnətin birgə olub biz çıxarıq,
Seyrü seyranına inşaallah.



Etina eyləmərik üqbanın
Huri-qılmanına inşaallah.

Son qoyub hicrinə Şahin Fazil,
Gələcək yanına inşaallah.

*28.04.2002*

*366-cı gün*

## QƏZƏL

Elə ki sən təki sevdalı nigarım getdi,
"Cənnətə birgə gedək" adlı şüarım getdi.

Xəstə dünyayə düşəndən bəri mən xəstə idim,
Səni sağlam görəli getdi azarım, getdi.

Ey məhəbbət bağımın türfə nübarı, yoxsan,
Acı qış gəldi, şirin, dadlı, nübarım getdi.

Kuzə sındı, daha yoxdur meyi meyxanəmizin,
Gəldi xiffət dəmi, ey saqi, xumarım getdi.

"Getdi ol zülfi siyəh, qoydu qara gündə məni,
Qalmışam indi pərişanü qərarım getdi". *

Sən cavansan hələ, yaz "Bəstənigar" eşqiylə,
Ey Qusarçaylı**, mənim "Bəstənigar"ım getdi.

Söyləsinlər mənə bundan belə Dərviş Şahin,
Dərvişəm, heç nə yoxumdur, daha varım getdi.

*29-30 aprel 2002*

---

* Beyt XIX əsr Şamaxı "Beytüs-səfa ədəbi məclisinin üzvü Mirzə Mahmud Zuinindir.

** Şair Ramiz Qusarçaylı

# MÜNDƏRİCAT

---

**Rəssam:** Azər
**Texniki redaktor:** Rahilə Məmmədova
**Kompüterdə yığanı:** Xalidə Mirzəağayeva

**Şahin FAZİL**
*(Şahin Fazil oğlu Fərzəlibəyli)*
**İLHAMƏ, YAXUD SƏNDƏN AYRI SƏNİNLƏ**
*(Azərbaycan dilində)*
Bakı-2002

**Yığılmağa verilmişdir:** 20.03.02
**Çapa imzalanmış:** 30. 03.02
**Formatı:** 70x90 1/32. **Ofset kağızı:** №1
**Tirajı:** 200 ədəd. **Həcmi:** 12 çap vərəqi.
**Sifariş:** №14

"Elnur-P" poliqrafiya müəssisəsində çap edilmişdir.